QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Fevral 2013
02 (1046)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Əlimərdan bəy Topçubaşovun 150 illik yubileyinin keçirilməsi haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



2013-cü ilin may ayında Azərbaycan Xalq Cümhuriyyətinin banilərindən biri, Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin sədri Əlimərdan bəy Ələkbər bəy oğlu Topçubaşovun anadan olmasının 150 illiyi tamam olur.

Şərq mədəniyyətinin xüsusiyyətlərini və Avropanın demokratik dəyərlərini üzvi şəkildə birləşdirməklə xalqımızın tarixi nailiyyəti kimi meydana çıxmış Azərbaycan Xalq Cümhuriyyətinin təşəkkül tapmasında, onun beynəlxalq aləmin subyekti olaraq dünya dövlətləri tərəfindən tanınması və diplomatik münasibətlərinin qurulmasında böyük xidmətlər göstərmiş görkəmli ictimai-siyasi xadim Əlimərdanbəy Topçubaşovun 150 illik yubileyinin keçirilməsini təmin etmək məqsədi ilə, Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

1. Azərbaycan Respublikasının XariciIşlər Nazirliyi Azərbaycan Milli Elmlər Akademiyası, Azərbaycan Respublikasının Təhsil Nazirliyi və digər aidiyyəti qurumlarla birlikdə Əlimərdanbəy Topçubaşovun 150 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 25 fevral 2013-cü il*

## Rektor Yusif Məmmədov "AHİK-in 20 illiyi" medalı ilə təltif edilib



*Xalqımızın görkəmli alimi, böyük ziyalısı, xeyirxah və alicənab insan, təcrübəli elm və təhsil təşkilatçısı, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov yüksək təltifata layiq görülüb. Belə ki, ADPU-nun rektoru, professor Yusif Məmmədov bu dəfə Azərbaycan Həmkarlar İttifaqları Konfederasiyası (AHİK) tərəfindən bu təşkilatın yaranmasının 20-ci ildönümü münasibətilə təsis edilmiş medalına layiq görülüb.*

*Məlumat üçün qeyd edək ki, rektor Yusif Məmmədov bu medala AHİK-inişində fəal iştirak etdiyinə, eyni zamanda rəhbərlik etdiyi ali təhsil müəssisəsində bu təşkilatın yüksək səviyyədə fəaliyyət göstərməsinə yaratdığı əlverişli şəraitə,həmçininquruma göstərdiyi xüsusi qayğı və diqqətə görə layiq görülüb. Fevral ayının 25-də Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqıRespublika Komitəsinin sədr müavini Mirzə Cəfərzadə ADPU-da olmuş və həmin medalı müvafiq vəsiqə ilə birlikdə rektor Yusif Məmmədova təqdim etmiş, xalqımızın bu böyük aliminə, dəyərli ziyalısına ən xoş, ən səmimi arzularını bildirərək ona bundan sonrakı fəaliyyətində də müvəffəqiyyətlər arzulamışdır.*

*Professor Yusif Məmmədov da öz növbəsində bu yüksək mükafata görə AHİK-in rəhbərliyinə öz səmimi təşəkkürünü bildirmişdir. RektorYusif Məmmədov bütövlükdə Universitet Həmkarlar İttifaqı Komitəsinin fəaliyyətindən razı qaldığını bildirmiş, ADPU rəhbərliyinin bundan sonra da butəşkilatla sıx əməkdaşlıq edəcəyini, quruma lazımi qayğı və diqqətin göstəriləcəyini xüsusi qeyd etmişdir.*

*Onu da qeyd edək ki, ADPU-nun rektoru, professor Yusif Məmmədov respublikamızın ali məktəb rektorları arasında AHİK-in bu medalına layiq görülən ilk rektordur. Biz də Yusif müəllimi bu mükafata layiq görülməsi münasibətilə ürəkdən təbrik edir, ona möhkəm cansağlığı, uzun ömür, idarəçilik fəaliyyətində və elmi-tədqiqatlarında yeni-yeni uğurlar, nailiyyətlər arzulayırıq.*

***Mətbuat və informasiya şöbəsi***

# ÖNCƏ VƏTƏNDİR!

## *Xocalı soyqırımının iyirmi birinci ildönümünə həsr edilmiş anım mərasimi*

*Qəhrəmanlar dünyaya gələr, ancaq dünyadan getməzlər.*
**El deyimi**

"Öncə Vətəndir!" Bu kəlmələri Qarabağ torpaqlarının yadelli ermənilərin əlinə keçməməsi üçün ilk dəfə 1988-ci ildə xalqımızın igid övladları Əli Hacıyevlə Bəxtiyar Quliyev dedilər.

Bu kəlmələri adlarını doğma Azərbaycanımızın XX əsr tarixində öz qanları ilə əbədiləşdirənYusif Mirzəyev, Şirin Mirzəyev, Allahverdi Bağırov, Seymur Məmmədov, Alı Mustafayev və onlarla başqa vətənpərvər övladları söylədilər.

Bu kəlmələr 1992-ci il fevral ayının 25-dən 26-na keçən gecə Xocalıda törədilən soyqırımının qarşısını almaq üçün ölüm-dirim savaşına atılmış Xocalı aeroportunun rəisi Əlif Hacıyevlə onun rəhbərlik etdiyi kiçik bir dəstənin, Tofiq Hüseynovun taborunun və minlərlə Xocalısakininin əməllərində göyərdi...

Bu kəlmələri ADPU-da 2013-cü il fevral ayının 25-dəXocalı qətliamının iyirmi birinci ildönümünə həsr edilmiş anım günündə hazırladıqları ədəbi-bədii kompozisiya ilə Pedaqogika və psixologiya fakültəsinin tələbələri də dilə gətirdilər. Təhsil aldıqları universitetin tələbələrinə bu qətliamda xalqımızın başına gətirilənləri bir-bir yada salıb dərk etdirmək, gecəsini-gündüzünü onların layiqli vətəndaş, qeyrətli vətənpərvərlər kimi formalaşmalarına həsr edən müəllimlərinə bu qanlı tarixin gələcək nəsillər tərəfindən əsrlər boyunca unudulmayacağını xatırlatmaq üçün.

Azərbaycanın Dövlət Himni ilə başlayan tədbiri Pedaqogika və psixologiya fakültəsinin tələbələri Vüsalə Hüseynova ilə Turan Kərimli açıblar. ADPU-nun rektoru,AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov çıxışına başlamazdan öncə tədbir iştirakçıları Xocalı soyqırımı zamanı, eləcə də Azərbaycanın müstəqilliyi, ərazi bütövlüyü və milli dövlətçiliyi uğrunda şəhid olmuş bütün soydaşlarımızın ruhlarını bir dəqiqəlik sükutla yad ediblər.

Rektor Yusif Məmmədov çıxışında bildirib ki, Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, akademik hörmətli Ramiz Mehdiyevin müvafiq sərəncamı ilə "Xocalı soyqırımının iyirmi birinci ildönümünün keçirilməsinə dair tədbirlər planı" təsdiq edib. Sərəncamda idarə və təşkilatlarda, teatr-konsert müəssisələrində, sərgi salonlarında, ali və orta ixtisas təhsili müəssisələrində xatirə gecələri, foto-rəsm sərgiləri, şahidlərlə görüşlər və digər tədbirlərin keçirilməsi, milli-azadlıq uğrunda mübarizəyə həsr edilmiş sənədli və bədii filmlərin nümayişi öz əksini tapıb. Sərəncamdan irəli gələn vəzifə olaraq fevral ayının 18-26-da PedaqojiUniversitetin bütün fakültə və şöbələrində Xocalı soyqırımı ilə əlaqədar anım mərasimləri və soyqırımının şahidləri ilə görüşlər keçirilib, ədəbi-bədii gecələr təşkil edilib, Xocalı qətliamını özündə əks etdirən foto-stendlər yaradılıb. Tələbə Gənclər Təşkilatı Kompyuter Mərkəzi ilə birlikdə universitetin İnternet saytına Xocalı soyqırımını əks etdirən materiallar daxil edib. Fevral ayının 25-də universitetin bütün fakültələrində ilk dərslər və seminar məşğələləri Xocalı soyqırımına həsr edilib. Ayın 26-da saat 1700-da bütünlüklə ölkə ərazisində Xocalı soyqırımı qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru, professor Y.Məmmədov çıxışında Xocalı faciəsini XX əsrdə ermənilər tərəfindən xalqımıza qarşı törədilmiş növbəti kütləvi qırğın, Azərbaycanın ərazi bütövlüyünə və dövlət müstəqilliyinə qarşı yönəlmiş ənənəvi terror siyasətinin tərkib hissəsi, bəşəriyyətə və insanlığa qarşı yönəlmiş ən qəddar cinayətlərdən biri adlandırıb.Rektor qeyd edib ki,beynəlxalq hüququn norma və prinsiplərinə məhəl qoyulmadan həyata keçirilən bu soyqırımı aktı xalqımızın azadlıq və müstəqillik istəyini məhv etməyə yönəldilmişdi. Həm də bu, ermənilər tərəfindən Xocalıda törədilən birinci qətliam deyil. Ermənilər hələ 1906 və 1918-ci illərdə bu şəhəri yandırıb külə döndərmiş, əhalisini isə qırıb məhv etmişdilər. 1992-ci il fevralın 25-dən 26-na keçən gecə 7 min əhalisi olan sakinlərindən 613 nəfər, o cümlədən 106 qadın, 63 uşaq, 70 qoca ermənilər tərəfindən xüsusi qəddarlıqla qətlə yetirilib, 1275 nəfər dinc sakin əsir götürülüb, 150 nəfər isə itkin düşüb, 8 ailənin həyatına son qoyulub, 25 uşaq hər iki valideynindən, 130 uşaq isə valideynlərinin birindən məhrum olub, 487 dinc sakin ağır yaralanıb.

Xocalı qətliamını"İkinci Dünya müharibəsindən sonrakı müasir dövrdə Ermənistan hərbi qüvvələrinin və Rusiyanın 366-cı motoatıcı alayının əsgərlərinin erməni separatçı-terrorçuları ilə birlikdə törətdiyi ən kütləvi və ən dəhşətli soyqırımı aktı" adlandıran professor Y.Məmmədov çıxışında deyib:"Beynəlxalq qanunlara görə, hər hansı bir ərazi silahlı qüvvələr tərəfindən mühasirəyə alınarkən dinc mülki əhalinin həmin ərazidən çıxması üçün bir koridor qoyulur. Mənfur ermənilər də guya Xocalıda dinc əhalinin çıxması üçün koridor qoymuşdular.Lakin bu istiqamətə üz tutan xocalıları erməni hərbçiləri elə həmin yolda ya əsir götürür, ya da vəhşicəsinə qətlə yetirirdilər. Bir çox meyitlərin bədənləri süngü ilə deşik-deşik edilmiş, başlarının dərisi soyulmuş, gözləri çıxarılmış, burun və qulaqları kəsilmişdi...

(Davamı 2-ci səhifədə)

# ÖNCƏ VƏTƏNDİR!

(Əvvəli 1-ci səhifədə)

Xocalı hərbi cinayəti, Xocalı soyqırımı işğalçı Ermənistanın Azərbaycana qarşı hərbi təcavüzünün əsl mahiyyətini və erməni vəhşiliyinin dəhşətlərini bütün çılpaqlığı ilə üzə çıxardı. Bu dəhşətli hadisə həm də Azərbaycanın Qarabağ müharibəsində aldığı ən böyük zərbə idi. Bu ağır zərbənin və hərbi uğursuzluğun ən böyük səbəbləri isə təbii ki, həmin dövrdə Azərbaycanın rəhbərliyində təmsil olunan şəxslərin məsuliyyətsizliyi, səriştəsizliyi və ən başlıcası isə, xalqımızın milli maraqlarına xəyanət etmələri olmuşdur.

Xocalı soyqırımının beynəlxalq ictimaiyyətə çatdırılması ilə bağlı əməli tədbirlər yalnız ulu öndərimiz Heydər Əliyevin Azərbaycanda yenidən ali dövlət hakimiyyətinə qayıtmasından sonra həyata keçirildi. Ümummilli lider işğalçı Ermənistanın Azərbaycana qarşı həyata keçirdiyi soyqırımı və terror siyasətinin mahiyyətini özündə dolğun əks etdirən faktların dünya ictimaiyyətinə çatdırılmasını müstəqil dövlətimizin xarici siyasətinin ən mühüm vəzifələrindən biri kimi müəyyənləşdirdi və bu istiqamətdə bir sıra səmərəli əməli tədbirlər həyata keçirdi. Bu tədbirlərdən biri Xocalı faciəsinə siyasi-hüquqi qiymətin verilməsi oldu. Xalqımızın dahi oğlu Heydər Əliyevin təşəbbüsü ilə 1994-cü il fevralın 24-də Milli Məclisdə «Xocalı Soyqırımı Günü haqqında» qərar qəbul edildi, BMT-yə və dünyanın aparıcı dövlətlərinə faciənin mahiyyətini açıqlayan və beynəlxalq ictimaiyyəti erməni terrorçularına qarşı təsirli tədbirlər görməyə çağıran müraciət ünvanlandı. Ulu öndərimiz Heydər Əliyev «Xocalı soyqırımı qurbanlarının xatirəsinə sükut dəqiqəsi edilməsi haqqında» 25 fevral 1997-ci il tarixli müvafiq sərəncam imzalamışdır ki, bu sərəncama əsasən hər il fevralın 26-sı saat 17.00-da Azərbaycan Respublikasının ərazisində Xocalı soyqırımı qurbanlarının xatirəsinə ehtiram əlaməti olaraq sükut dəqiqəsi elan edilir.




Paytaxtın Xətai rayonunda Xocalı qurbanlarının xatirəsini əbədiləşdirən abidənin ucaldılması da faciə zamanı həlak olmuş soydaşlarımızın ruhuna hörmət və ehtiramın ifadəsidir.

Xocalı faciəsi zamanı həlak olmuş soydaşlarımızın ailələrininqayğıları Azərbaycan Prezidenti İlham Əliyevin diqqət mərkəzindədir. Respublikamızın 48 rayonunda məskunlaşmış xocalılara dövlət səviyyəsində hər cür diqqət və köməklik göstərilir. Bir faktı xüsusi qeyd etmək istəyirəm ki, - dedi rektor Y.Məmmədov, - son illər Xocalı faciəsinin beynəlxalq miqyasda tanınması istiqamətində mühüm addımlar atılıb. Avropa Şurası Parlament Assambleyasının 2012-ci ilin yanvar ayında keçirilən sessiyasında azərbaycanlı millət vəkillərinin təşəbbüs və səyləri ilə Xocalı soyqırımını pisləyən bəyanat yayılıb. Azərbaycan Prezidenti cənab İlham Əliyevin həmin il yanvar ayının 17-də imzaladığı sərəncama əsasən bu qətliamın iyirminci ildönümü ölkəmizdə dövlət səviyyəsində qeyd edildi:dövlət başçısı İlham Əliyevin rəhbərliyi ilə fevral ayının 26-da xalqımız Bakıda Xocalı faciəsinin iyirminci ildönümü ilə əlaqədar möhtəşəm bir yürüş keçirdi ki, bu da dünya ictimaiyyətinin diqqətini yenidən Xocalı soyqırımına yönəltdi. Ötən illərdə olduğu kimi bu il də Xocalı faciəsi ilə əlaqədar dünyanın bir çox ölkələrində konfranslar, dəyirmi masalar, etiraz aksiyaları və digər tədbirlər həyata keçirilir və belə tədbirlərin gələcəkdə də davam etdirilməsi nəzərdə tutulur. Bu siyasətin həyata keçirilməsində qardaş Türkiyə Azərbaycana böyük siyasi və mənəvi dəstək verir. Artıq Türkiyənin bir çox mərkəzi şəhərlərində Xocalı soyqırımının iyirmi birinci ildönümünə həsr edilmiş müxtəlif tədbirlər keçirilib və həmin tədbirlər davam etdirilir.

Rektor Y.Məmmədov Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla Əliyevanın təşəbbüsü ilə son beş ildə beynəlxalq miqyasda «Xocalıya ədalət!» kampaniyası çərçivəsində həyata keçirilən tədbirlərdən, bu tədbirlərin



dünyanın bir çox ölkələrində uğurla gerçəkləşdirildiyindən də söz açdı. Bu kampaniya çərçivəsində İslam Əməkdaşlıq Təşkilatı Gənclər Forumunun və Ukrayna Azərbaycanlı Gənclər Birliyinin keçən ilin fevral ayını Ukraynada «Xocalı ayı» elan etdiyini, həmçinin YAP Gənclər Birliyinin ötən il «Xocalı soyqırımını tanı!» kampaniyası həyata keçirdiyini söylədi. “Xocalı soyqırımını tanı!” kampaniyası çərçivəsində Xocalı qətliamını əks etdirən bir sıra faktların, fotoşəkilin və digər məlumatların dünyanın bir çox aparıcı dövlətlərinin, o cümlədən Fransanın senatına və hökumətinə göndərildiyini dedi. Ukraynada bu il də fevral ayı “Xocalı ayı” elan edilib. Natiqin çıxışından o da məlum oldu ki, Pakistan İslam Respublikasının Senatı ötən il fevralın 1-də yekdilliklə Xocalı faciəsini kəskin pisləyən qətnamə qəbul edib və faciəni soyqırımı aktı kimi tanıyıb. Meksika da rəsmi qaydada Xocalı faciəsini soyqırımı kimi tanıyıb. Kampaniya bu il də uğurla davam etdirilir.

Rektor Y.Məmmədov çıxışının bu yerində Birləşmiş Millətlər Təşkilatı Təhlükəsizlik Şurasının münaqişənin qeyd-şərtsiz həllinə dair 822, 853, 874, 884 saylı qətnamələrinin, eləcə də Avropa Şurası Parlament Assambleyasının və Avropa Təhlükəsizlik və Əməkdaşlıq Təşkilatının münaqişə ilə bağlı müvafiq qərarlarının bugünədək icra edilməməsindən və ermənilərin beynəlxalq hüququn norma və prinsiplərinə əsla məhəl qoymadan yaxın vaxtlarda Xocalıda beynəlxalq hava limanının istifadəyə veriləcəyi iddiası ilə çıxış etmələrindən, həmçinin,beynəlxalq təşkilatların və dünyanın siyasi güc mərkəzlərinin bütün bunlara soyuqqanlı münasibətindən təəssüfləndiyi fikrini ifadə etdi.

Rektor Y.Məmmədov çıxışının sonunda Xocalı soyqırımının iyirmi birinci ildönümünə həsr etdikləri dərin məzmunlu ədəbi-bədii kompozisiyaya görə Pedaqogika və psixologiya fakültəsinin dekanı, dosent Şəhla Əliyevaya və fakültənin tələbələrinə öz dərin təşəkkürünü bildirdi.

***

TədbirdəTürk və Şərqi Avropa xalqları tarixi və onun tədrisi metodikası kafedrasının professoru,tarix elmləri doktoru Mais Əmrahov “Xocalı soyqırımı: ötən əsrin əvvəllərindən başlanan soyqırımın finalı” mövzusunda məruzə etdi (məruzəni ixtisarla oxuculara təqdim edirik).

Sonra tələbələrin ifasında “Öncə Vətəndir”! adlı ədəbi-bədii kompozisiya təqdim olundu.

Yazıçı-alim Əzizə Cəfərzadənin “Başını uca tut, Vətən!” sərlövhəli publisistik qeydlərindəki “Vətən bir torpaqdır,ərzin bir parçasıdır. Əgər sən onu cənnətə döndərə bilirsənsə, kəndlər, şəhərlər salıb üzərində nəsil yetişdirirsənsə, ən başlıcası isə sən bu torpaq uğrunda ölə bilirsənsə, demək o yer, o torpaq sənin əcdadının və gələcək nəslinin Vətənidir” - kəlmələri ilə yaşıdlarında Vətənə, doğma yurda məhəbbət duyğuları aşılayan aparıcıların çıxışlarında aşağıdakı fikirlər leytmotiv kimi səsləndi: Qəhrəmanlıq - həm də elə bir yüksək zirvədir ki, o zirvəyə ucalmaq üçün gərək bəşəriyyətin, tarixin, ən əsası isə məxsus olduğun xalqın, millətin sınağından mərdanəliklə çıxasan. Azərbaycan tarixində də bələləri az deyil. Ölkəmizin ərazi bütövlüyü uğrunda şəhid olan, qəhrəmanlıq hünərilə tarix yazan təəssübkeş oğul və qızlarımız hər zaman olub, indi də var.Elə biz də özümüzün vətəndaşlıq borcumuz bilib, fakültəmizin dekanı, dosent Şəhla Əliyevanın rəhbərliyi altında onların xatirəsinə həsr olunmuş “Öncə Vətəndir”! adlı ədəbi-bədii kompozisiya təşkil etdik” - söylədi aparıcılar.

Yetişməkdə olan nəsildə vətəndaşlıq və vətənpərvərlik duyğuları təbliğ edən bu anım mərasimi dəfələrlə alqışlarla qarşılandı.

**A.İsgəndərov**



## XOCALI

Tək qalıb vuruşdun darda, çətində,
İki müqəssir var müsibətində:
Daşnak canilərlə daxili qurdlar;
Mərmi yağdırdılar, pusqu qurdular.
Döndün yaralanmış mərdə, Xocalı!
Bu qan qalmayacaq yerdə, Xocalı!

Neçə gənc ananın, məsum körpənin
Sinəsi atəşə hədəf, tuş oldu;
Bakıya çatanda harayın sənin,
Sandım ki, mənim də dərim soyuldu.
Alışdı səma da, yer də, Xocalı!
Bu qan qalmayacaq yerdə, Xocalı!

Birləşib qələbə çalmasaq əgər,
Sənin qisasını almasaq əgər,
Demək, nə millətik, nə xalqıq onda;
Batarıq zamanın burulğanında.
Bir də söyləyirəm, bir də, Xocalı:
Bu qan qalmayacaq yerdə, Xocalı!

## VƏTƏN

Taleyin sərt yollarını kəsib çən, duman,
Cırtdan boylu o iblisi qudurdub azman;
Yaxın-uzaq rəqiblərin çoxalıb yaman.
Sənə yenə yad nəzərlər tuşlanır, Vətən!

Əlincənə, Gəncənə kəc baxana lənət!
Tarixinə öz çirkini yaxana lənət!
Çörək kəsib, sonra namərd çıxana lənət!
Nifrətimdə daş əriyir, su yanır, Vətən!

Həm qabağı, həm gerini görməliyik biz,
Torpağı yox, qəm yükünü bölməliyik biz;
Səndən ötrü lazım gəlsə ölməliyik biz.
Nahaq qandan qəddar yağı xoşlanır, Vətən!

Yaralanmış durnalarım Sərhəngə endi,
Tərtər boyu çəkdiyim ah ərşə dirəndi.
Muğan dədə-baba yurdum olsa da, indi
Mənim üçün Qarabağdan başlanır Vətən!

**Oqtay Rza,**
**Azərbaycan Yazıçılar Birliyinin üzvü, Beynəlxalq Rəsul Rza, M.Müşfiq və “Araz” ali ədəbi mükafatları laureatı, Əməkdar müəllim**

# Elmi Şuranın geniş tərkibdə iclası



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının fevral ayının 28-də geniş tərkibdə keçirilən iclasında Elmi Şuranın üzvləri ilə yanaşı, universitetin müəllimləri, əməkdaşları və tələbələriiştirak edirdilər. İclasın gündəlyində üç məsələ dayanırdı:

1. Azərbaycan Respublikasının Korrupsiyaya qarşı Mübarizə Komissiyasının 26 yanvar 2013-cü il tarixli iclasının qərarı və ondan irəli gələn vəzifələr, Azərbaycan Respublikası təhsil nazirinin bu məsələyə həsr olunmuş 21 fevral 2013-cü il tarixli əmri və müvafiq tədbirlər planı haqqında;



2.Yeni maliyyələşdirmə mexanizminin tətbiqi ilə bağlı Elmi Şuranın 2012-ci il 16 noyabr tarixli iclasında yaradılmış komissiyanın hesabatı və təklifləri;

3. "İlin müəllimi" müsabiqəsinin yekunları.

Hər üç məsələ haqqında ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Elmi Şuranın sədri, professor Yusif Məmmədov məlumat verdi.



Rektor Yusif Məmmədov öz çıxışında ilk olaraq iclas iştirakçılarının diqqətiniAzərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin sədrliyi ilə Nazirlər Kabinetinin bu il yanvar ayının 15-də 2012-ci ilin sosial-iqtisadi inkişafının yekunlarına və 2013-cü ildə qarşıda duran vəzifələrə həsr olunan iclasında korrupsiyaya qarşı mübarizə sahəsində mühüm vəzifələrin müəyyən edildiyinə yönəltdi. Rektor Y.Məmmədov qeyd etdi ki,təhsil sahəsində mövcud olanmənfi halların aradan qaldırılması məqsədilə Azərbaycan Respublikasının Korrupsiyaya qarşı Mübarizə Komissiyasınınsədri, hörmətli Ramiz Mehdiyevinrəhbərliyi ilə bu il yanvar ayının 26-da təhsil idarəçiliyinə məsul vəzifəli şəxslərinin iştirakı ilə geniş tərkibdə iclası keçirilib. Həmin iclasda qeyd olunan nöqsanların aradan qaldırılması, təhsil müəssisələrində şəffaflığın təmin edilməsi və tədrisin keyfiyyətinin yüksəldilməsi istiqamətində ciddi müzakirələr aparılıb və qərar qəbul edilib. Həmçinin həmin iclasın qərarından irəli gələn vəzifələrlə əlaqədar təhsil nazirinin 21 fevral 2013-cü il tarixli əmri ilə müvafiq tədbirlər planı təsdiq edilib.

Belə hesab edirəm ki, - dedi rektor Y.Məmmədov, - bizim kollektivdə sağlam mənəvi-psixoloji mühit, işgüzar əhval-ruhiyyə var.- Lakin biz yenə də öz gündəlik əməli fəaliyyətimizdə məsuliyyətimizi daha dərindən dərk etməli, işimizi iclasda qoyulan tələblər səviyyəsində və qanunun aliliyi əsasında qurmalıyıq.

Korrupsiyaya qarşı Mübarizə Komissiyasının qərarını ətraflı şərh edən rektor Y.Məmmədov xüsusilə dekanların və kafedra müdirlərinin fəaliyyətinin, eyni zamanda universitetindissertasiya MüdafiəsiŞurasınınfəaliyyətinin daha da gücləndirilməsinin vacib olduğunu xüsusi qeyd etdi. Müəllimlərin tədris olunan mövzuları tədris etmələrinə nəzarətin gücləndirilməsini, dərsdənkənar mövzulara yol verilməməsini dekanlıq və kafedra müdirləri qarşısında bir vəzifə olaraq qoydu. Müəllimin dərsdemə səviyyəsindən tələbənin nəyə görə razı, hansı səbəbdən narazı qaldığının portallar vasitəsilə müəyyənləşdiriləcəyini söylədi. Rektor dedi: "Müəllimlər tədris prosesi zamanı istifadə etdikləri dərsliklərin tədris üçün yararlı olub-olmaması məsələsinə ciddi diqqət yetirməli, tələbəyə hansı dərsliyin dərslik kimi, hansının əlavə vəsait kimi oxunmasını tövsiyə etməlidirlər. Tədrisə yaramayan dərsliklərin tədris prosesindən yığışdırılması məsələsini qaldırmalıdırlar. Təhsillə bağlı bütün məsələlər universitetin İnternet səhifəsində yerləşdirilməlidir ki, tələbə hər hansı bir sorğuya cavab tapmaq üçün vaxt itirib dekanlığa müraciət etmək kimi bir qayğıdan uzaq olsun.

Rektor Y.Məmmədov çıxışının sonunda həm də universitet TələbəGənclər Təşkilatının da fəaliyyətinin gücləndirilməsinin vacibliyini qeyd etdi..

* * *

Yeni maliyyələşdirmə mexanizminin tətbiqi ilə bağlı yaradılmış komissiyanın fəaliyyəti barədə məlumat verən rektor Y.Məmmədov komissiyanın irəli sürdüyü təkliflərlə Şura üzvlərini tanış etdi.

Rektor Y.Məmmədov 2011-2012-ci ilin "İlin müəllimi" müsabiqəsinin yekunları barədə də Şura üzvlərini məlumatlandırdı.

**Humanitar elmlər üzrə:**

**I yer - Cavadov Təyyar Salam oğlu** - Azərbaycan ədəbiyyatı tarixi kafedrasının professoru;

**II yer - Əsgərli Füzuli Feyruz oğlu** - Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının dosenti;

**III yer - Abdullayeva Gülhəyat Mətləb qızı** - İngilis dili və onun tədrisi metodikası kafedrasının baş müəllimi;

**Həvəsləndirici mükafat - Bağırova Tamilla Əli qızı** - Musiqi alətləri və onların tədrisi metodikası kafedrasının professoru.

**Dəqiq və təbiət elmləri üzrə:**

**I yer - Quliyev Ədalət Firudun oğlu** - Elektroradio-texnika kafedrasının baş müəllimi;

**II yer - Eyvazov Edil Əli oğlu** - Molekulyar fizika kafedrasının müdiri, professor;

**III yer - Qarayev Məmməd Abbas oğlu** - İnsan və heyvan fiziologiyası kafedrasının professoru.

# Dövlət Miqrasiya Xidmətinin əməkdaşları universitetimizdə



Fevral ayının 22-də keçirilən bu tədbirdə əsasən türkiyəli tələbələr iştirak edirdilər. Tədbiri ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru, dosent Mehdi Abdullayev açaraq qonaqları salamlayıb. Sonra çıxış üçün söz Dövlət Miqrasiya Xidmətinin (DMX) baş idarə rəisi Elxan Vəliyevə verilib.

DMX-nin baş idarə rəisi Elxan Vəliyev çıxışında bu xidmətin yaranma tarixi və fəaliyyət istiqamətləri haqqında zala toplaşanlara ətraflı məlumat verdi. E.Vəliyev dedi ki, Azərbaycan Respublikasında miqrasiya sahəsində dövlət siyasətinin həyata keçirilməsi, qanunvericiliyin beynəlxalq normalara və müasir dövrün tələblərinə uyğun təkmilləşdirilməsi, milli təhlükəsizliyin və sabit sosial-iqtisadi, demoqrafik inkişafının təmin edilməsi, əmək ehtiyatlarından səmərəli istifadə edilməsi, ölkə ərazisində əhalinin mütənasib yerləşdirilməsi, miqrantların intellektual və əmək potensialından istifadə edilməsi, tənzimlənməyən miqrasiya proseslərinin mənfi təsirinin aradan qaldırılması, insan alveri də daxil olmaqla, qeyri-qanuni miqrasiyanın qarşısının alınması məqsədi ilə Azərbaycan Respublikası Prezidentinin 25 iyul 2006-cı il tarixli sərəncamı ilə "Azərbaycan Respublikasının Dövlət Miqrasiya Proqramı (2006-2008-ci illər)" təsdiq edilmişdir.

Bu Dövlət Proqramının əsas məqsədi miqrasiya sahəsində dövlət siyasətinin həyata keçirilməsi, miqrasiya idarəetmə sisteminin inkişaf etdirilməsi, miqrasiya proseslərinin tənzimlənməsi və proqnozlaşdırılması, bu sahədə qanunvericiliyin beynəlxalq normalara və müasir dövrün tələblərinə uyğun təkmilləşdirilməsi, qanunların tətbiqinin effektivliyinin təmin edilməsi, miqrasiya sahəsində vahid məlumat bazasının, müasir avtomatlaşdırılmış nəzarət sisteminin yaradılması, qeyri-qanuni miqrasiyanın qarşısının alınması, beynəlxalq əməkdaşlığın inkişaf etdirilməsi tədbirlərinin həyata keçirilməsindən ibarətdir. Proqramda miqrasiya proseslərinin xüsusiyyətləri, bu sahədə dövlət siyasətinin prioritet istiqamətləri öz əksini tapmışdır. Bununla yanaşı, proqramın əhatə etdiyi dövr ərzində DMX-ninayrı-ayrı dövlət qurumları ilə əlaqəli şəkildə həyata keçirməli olduğu tədbirlər göstərilmişdir.



Baş idarə rəisi E.Vəliyevmiqrasiya sahəsində dövlət siyasətini, miqrasiya proseslərinin idarə edilməsi və tənzimlənməsində Azərbaycan Respublikasının qanunvericiliyi ilə müəyyən edilmiş səlahiyyətləri həyata keçirmək məqsədilə Azərbaycan Respublikası Prezidentinin 19 mart 2007-ci il tarixli fərmanı ilə Dövlət Miqrasiya Xidmətinin yaradıldığını və Xidmətin Əsasnaməsinin təsdiq edildiyini söylədi.Əcnəbi tələbələr Elxan müəllimin çıxışından öyrəndilər ki, DMXAzərbaycan Respublikasının Konstitusiyasını, qanunlarını, Prezidentin fərman və sərəncamlarını, Nazirlər Kabinetinin qərar və sərəncamlarını, ölkəmizin tərəfdar çıxdığı beynəlxalq müqavilələri və öz Əsasnaməsini rəhbər tutur. DMX öz vəzifələrini yerinə yetirərkən və hüquqlarını həyata keçirərkən mərkəzi, yerli icra hakimiyyəti və yerli özünüidarəetmə orqanları ilə, habelə beynəlxalq və qeyri-hökumət təşkilatları ilə qarşılıqlı əlaqədə fəaliyyət göstərir. Ən əsası isə DMX fəaliyyətini insan və vətəndaş hüquq və azadlıqlarına hörmət, qanunçuluq və humanizm prinsipləri əsasında qurur.

Belə ki, DMX-nin fəaliyyəti çərçivəsində həyata keçirilən tədbirlərin sırasına miqrasiya proseslərinin təhlili, proqnozlaşdırılması və monitorinqin təşkil edilməsi, miqrasiya sahəsində vahid informasiya sisteminin yaradılması, bu sahədə beynəlxalq əməkdaşlığın inkişaf etdirilməsi, əcnəbi və vətəndaşlığı olmayan şəxslərə müvəqqəti və daimi yaşamaq üçün icazənin verilməsi, immiqrant statusunun verilməsi, respublikamıza gələn əcnəbi və vətəndaşlığı olmayan şəxslərin ölkədə müvəqqəti olma müddətlərinin uzadılması ilə bağlı qərarın verilməsi, o cümlədən vətəndaşlıq, qaçqın statusunun müəyyənləşdirilməsi kimi məsələlər daxildir.

Eyni zamanda ölkədə olan qanunsuz miqrantlarla bağlı araşdırma, təhlil və təftiş işləri apararaq onların ölkə ərazisindən çıxarılması işinə də ciddi nəzarət edir. Yuxarıda sadalananları həyata keçirmək üçün DMXDaxili İşlər, Xarici İşlər, Milli Təhlükəsizlik, Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirlikləri və Dövlət Sərhəd Xidməti ilə birlikdə fəaliyyət göstərir.

DMX-nin Miqrasiya Məlumat Mərkəzi olan 919-un xidmətindən istifadə etməklə bütün suallara bu xidmət vasitəsilə cavab tapmaq mümkündür.

Görüşdə DMX-nin baş inspektoru Aynur Rüstəmova və ADPU-nun Əcnəbi tələbələrin işi üzrə fakültəsinin dekanı, dosent Nurəddin Uluxanlı da iştirak etmişlər.

Tədbirdə türkiyəli tələbələri maraqlandıran suallar geniş və dolğun şəkildə cavablandırılmışdır.

**Səhifəni hazırladı: A.İSGƏNDƏROV**

# YAP-ın Səbail rayon təşkilatının yaradılmasının 20-ci ildönümünə həsr edilmiş konfrans

Fevral ayının 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının yaradılmasının 20-ci ildönümünə həsr edilmiş konfrans keçirilib. Konfrans müstəqil Azərbaycan dövlətinin, eyni zamanda YAP-ın yaradıcısı və qurucusu, ümummilli lider Heydər Əliyevin ADPU-da




ucaldılmış abidəsinin önündən başlayıb, sonra universitetin akt zalında davam etdirilib.

Öncə ötən müddət ərzində dünyasını dəyişmiş təşkilat üzvlərinin xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Azərbaycanın Dövlət Himni səsləndirildikdən sonra tədbiri giriş sözü ilə YAP-ın Səbail rayon təşkilatının sədri, professor Zahid Qaralov açaraq gündəlikdə duran məsələlərlə konfrans iştirakçılarını tanış edib. Partiyanın yaradıldığı günləri yada salan professor Z.Qaralov YAP-ın yalnız “91-lər”in deyil, bütövlükdə respublika əhalisinin mütərəqqi fikirli təbəqəsinin tələbi ilə yaradıldığını deyib.

Ölkəmizdə ictimai-siyasi proseslərin gərgin cərəyan etdiyi XX əsrin sonlarını xatırlayan məruzəçi respublikamızın müxtəlif rayonlarını təmsil edən 550 nəfər nümayəndənin iştirak etdiyi YAP-ın təsis konfransının hamıya məlum səbəblərdən 1992-ci il noyabr ayının 21-də Naxçıvanda ke-



çirildiyini və ulu öndər Heydər Əliyevin yekdilliklə partiyanın sədri seçildiyini söyləyib.

Professor Z.Qaralov 17 nəfərdən ibarət Təşəbbüs Qrupunun təsis konfransını hansı təhlükələrdən adlayaraq keçirdiklərini bir daha yada salaraq deyib ki, ötən 20 il ərzində təşkilatın üzvləri partiyanın yaradıcısı və qurucusu, ulu öndər Heydər Əliyevin irəli sürdüyü ideyaları, partiyanın təsis konfransında qəbul edilmiş Nizamnamə və Məramnaməni, eləcə də partiya rəhbərliyinin göstərişlərini ardıcıl surətdə yerinə yetiriblər. Ulu öndər Heydər Əliyevin “YAP dünənin, bu günün və gələcəyin partiyasıdır” kəlamını xatırladan professor Z.Qaralov YAP-ın iqtidar partiyası olduğu 20 il ərzində doğma Azərbaycanımızın hərtərəfli inkişaf etməsində böyük rol oynadığını və gələcəkdə də respublikamızın çiçəklənməsinə xidmət göstərəcəyini qeyd edib. Qarşıdan gələn prezident seçkilərində YAP üzvlərini əhali arasında, xüsusilə də gənclər arasında geniş təbliğat işi aparmağa, Ulu Öndərin layiqli varisi olan cənab İlham Əliyevə yekdilliklə səs verməyə çağırıb. Professor Z.Qaralov bu prezident seçkilərinin də Azərbaycanın tarixinə YAP-ın növbəti qələbəsi kimi daxil olacağına əminliyini ifadə edib.

Tədbirdə Azərbaycan Dövlət İqtisad Universitetinin rektoru, Milli Məclisin Elm və təhsil komitəsinin sədri, professor Şəmsəddin Hacıyev, ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov, Səbail RİH-nin başçısı Asif Əsgərov, ADPU-nun Azərbaycan dilçiliyi kafedrasının müdiri, professor Nizami Xudiyev, YAP-ın Səbail rayon təşkilatının sədr müavini Afət Xanbabayeva, Gənclər Təşkilatının sədri Rəşad Fərəcov və Səbail rayon təşkilatının idarə heyətinin üzvü Rizvan Vahabov çıxış ediblər. Çıxışlarda YAP-ın respublikamızın siyasi həyatındakı avanqard rolu, cəmiyyətimizin ən güclü siyasi partiyası olduğu fikri xüsusi vurğulanıb. Yarandığı gündən siyasi xəttinə sadiqliyi, son 20 ildə ölkədə qazanılan uğurlarda xalq, dövlət qarşısında əvəzsiz xidmətləri, ümumxalqpartiyası olması fikri təkrar-təkrar qeyd olunub. “Partiyanın yaradılmasıümummilli lider Heydər Əliyevin Azərbaycan xalqı, Azərbaycan dövləti qarşısındakı xidmətlərindən yalnız biridir”,“yalnız YAP-ın siyasi arenaya çıxması Azərbaycana siyasi sabitlik gətirib”, “ölkənin müstəqillik, suverenlik və demokratiya yolunda inamla addımlamasına, 20 il ərzində böyük nailiyyətlər qazanmasına səbəb olub” kimi diqqətəlayiq fikirlər konfransda leytmotiv kimi səslənib.

ADPU-nun rektoru, professor Yusif Məmmədov çıxışında YAP-ın Səbail rayon təşkilatının təsis konfransının məhz ADPU-da keçirilməsindən və universitetin mütərəqqi fikirli əməkdaşlarının YAP-ın təşkilatlanmasında göstərdikləri fəallıqdan, “91-lər” dən 11 nəfərinin Pedaqoji Universitetin müəllimi olmasından qürur duyduğunu, universitet ərazi ilk partiya təşkilatının həmişə fəal olduğunu söyləyib. Rektor Y.Məmmədov deyib ki,YAP bu gün ölkədə ən nüfuzlu və mütəşəkkil partiyadır. Ümumxalq partiyası olan YAP-ın sıralarında xalqın bütün təbəqələrinin nümayəndələri təmsil olunur. YAP ona görə nüfuzludur ki, bu gün bu siyasi təşkilata bütün fəailiyyəti ilə Azərbaycan xalqının sevimlisinə çevrilən möhtərəm Prezidentimiz cənab İlham Əliyev rəhbərlik edir. 4 prezident, 4 parlament, 3 bələdiyyə seçkilərində iştirak edən və hər dəfə də böyük səs çoxluğu ilə digər partiyaları üstələyən YAP günü-gündən nüfuzunu daha da artırır.

Əkrəm Naibovun “Daş yuxular” romanını mövzu müstəvisinə gətirən ADPU-nun rektoru, professor Yusif Məmmədov çıxışında deyib: “Mən bu romanı oxumuşam, oxumayanlar da oxusunlar. Bu imkanı olmayanlar isə bilsinlər ki, kitab əvvəldən sona kimi şərdir, böhtandır. Burada Azərbaycan xalqı, Azərbaycan insanı haqqında müsbət heç nə yoxdur. Əksinə, tarixi düşmənimiz olan ermənilər təriflənir. Əsərdə Azərbaycan xalqına böhtan atılır. Xocalı hadisələri haqqında həqiqətləri bilən bir yazıçının bütöv bir xalqı təhqir etməyə haqqı varmı?!

Rektor Y.Məmmədov çıxışının sonunda deyib: “Bu il ölkəmizdə növbəti prezident seçkiləri keçiriləcək. YAP üzvləri və ümumiyyətlə, ölkəsini, xalqını düşünən hər bir azərbaycanlı üçün çox məsuliyyətli bir ildir. Mən şəxsən xalqın YAP-a səs verəcəyinə inanıram. Burda əsas diqqət ona yönəldilməlidir ki, qarışıqlıq salmağa cəhd göstərənlərə imkan verilməsin. Çıxışımın sonunda bir daha əminliklə bildirirəm ki, YAP-ın üzvü olan və olmayan hər kəs, o cümlədən ADPU ərazi ilk partiya təşkilatının üzvləri Azərbaycandakı bu inkişafı, respublikamızda gedən prosesləri, cənab Prezidentin qazandığı uğurları yaxşı görür, dərk edir və onu dəstəkləyirlər. Çalışacağıq bütün məsələlərdə Prezidentimizə, deməli, xalqımıza dəstək olaq”.

***

Sonra YAP-ın sıralarına yeni qəbul olunan gənclərə partiya biletləri, həmçinin 15 ildən artıq partiya üzvü olanlara rayon təşkilatının veteranı vəsiqələri və fəxri fərmanlar verildi.

Konfransda Azərbaycan Respublikasının Prezidenti, YAP-ın Sədri İlham Əliyevə müraciət qəbul olundu.

**A.İSGƏNDƏROV**

*Ümummilli lider Heydər Əliyev-90*

# Ulu öndər Heydər Əliyev Azərbaycanın tarixi mədəniyyət irsinin xilaskarıdır



Ümummilli lider Heydər Əliyev Azərbaycana rəhbərlik etdiyi (Azərb. KPMK-in I katibi) illər ərzində (1969-1982) və eləcə də Moskvada Sov. İKP MK-nın Siyasi Bürosunun üzvü olduğu və SSRİ Nazirlər Soveti Sədrinin birinci müavini vəzifəsində işlədiyi dövrdə (1982-1987) daim xalqımızın maddi-mənəvi irsinin qorunması və gələcək nəsilllərə çatdırılması haqqında düşünmüşdür.

Ulu öndər Heydər Əliyev 1990-cı ildə Moskvadan doğma Naxçıvana qayıtdı, müstəqil Azərbaycan dövlətini yaratdı, qurdu, gücləndirdi. Azərbaycan Respublikasının Prezident kimi çox mürəkkəb iqtisadi, siyasi problemləri məharətlə həll etməklə yanaşı, yenə də tarix və mədəni abidələrinin qorunmasını ön plana çəkdi.

Dahi öndər Heydər Əliyevin Azərbaycanın maddi və mənəvi mədəniyyəti ilə bağlı özünəməxsus türkçülük və azərbaycançılıq konsepsiyası, obyektiv elmi əsaslara söykənən ideyası tarixşünaslığımız üçün çox dəyərlidir.

Böyük şəxsiyyət Heydər Əliyevin elmi-nəzəri baxışları tarix və mədəniyyət abidələrini (tarix, arxeoloji, şəhərsalma və memarlıq, incəsənət), keçmiş nəsillərin maddi və mənəvi həyatını, Vətənimizin çoxəsrlik tarixini, onun azadlığı və istiqlaliyyəti uğrunda xalq kütlələrinin mübarizəsini, inqilabı hərəkatı, Azərbaycan dövlətinin təşəkkülünü və inkişafını əks etdirir.

Məhz ulu öndər Heydər Əliyevin qayğısı sayəsində Azərbaycanda 1970-ci ildən etibarən tarix və mədəniyyət abidələrinin geniş elmi tədqiqinə lazımi şərait yaradılmış, arxeoloji tədqiqatlar nəticəsində Azərbaycan tarixinin problem məsələlərinin araşdırılması sahəsində mühüm elmi nailiyyətlər qazanılmışdır.

Ulu öndər Heydər Əliyev “tarixi olduğu kimi qəbul etmək, dərk etmək və olduğu kimi qiymətləndirmək lazımdır” müdrik ideyasını tövsiyə etmişdir.

Azərbaycanın tarixi mədəniyyət irsinin, maddi-mədəniyyət abidələrinin dövlət səviyyəsində qorunması və elmi tədqiqi böyük öndər Heydər Əliyevin adı ilə bağlıdır.

Ümummilli lider Heydər Əliyevin tarixi tədqiqatlarla bağlı nəzəri baxışları müasir Azərbaycan tarixşünaslığında dərk edilərək yüksək qiymətləndirilir və düzgün istiqamətdə inkişaf etdirilir. Ulu öndərin maddi və mənəvi qaynaqlar əsasında xalqımızın tarixinin stratiqrafik aspektdə, xronoloji ardıcıllıqla yenidən və düzgün araşdırılması barədə fikri çox böyük elmi dəyərə malikdir.

Cənubi Qafqazda milyon illər əvvəl məskunlaşmış ibtidai insan nəsillərinin mədəniyyətini, xalqımızın etnik soykökünü yaradan ulu türk nəsillərinin həyat tərzini, Azərbaycanda e.ə. IV minillikdən etibarən iri tayfa birliyi kimi meydana gələn ilkin dövlət qürumlarının səciyyəvi xüsusiyyətlərini, antik və orta əsrlər dövrü dövlətçilik tarixinin təkamül yolunu ardıcıl araşdırmaq üçün Azərbaycan ərazisindəki tarixi abidələr müstəsna dəyərə malik olub, çox böyük elmi əhəmiyyət kəsb edir.

Azərbaycan ərazisində maddi-mədəniyyət abidələrinin vəziyyəti və qorunmasına xüsusi qayğı sayəsində tarixi qaynaqların elmi tədqiqinə şərait yaradıldı. Bu məsələ 1973-cü ilin iyulunda Azərbaycan SSR Ali Sovetinin beşinci sessiyasında müzakirə edilmişdir. Həmçinin 1976-cı ildə “Azərbaycan SSR-də Tarix və mədəniyyət abidələrinin mühafizəsi və bərpası işinin yaxşılaşdırmaq haqqında” mühüm tarixli qərar qəbul edilmişdir. 1978-ci il 21 iyulunda isə “Tarix və mədəniyyət abidələrinin mühafizəsi və onlardan istifadə haqqında Azərbaycan SSR qanunu” qəbul olunmuşdur.

Azərbaycanın Tarix və Mədəniyyət Abidələrinin Mühafizəsi Cəmiyyətinin Nizamnaməsi Azərbaycan SSR Nazirlər Sovetinin 27 yanvar 1982-ci il tarixli 50 №li qərarı ilə təsdiq edilmişdir.

Ulu öndər Heydər Əliyev Azərbaycanın müxtəlif bölgələrində aparılan arxeoloji tədqiqatlarla daim maraqlanmış,bir sıra nadir tarixi abidələrin qazıntılarını bilavasitə nəzərdən keçirib dəyərli fikirlər söyləmiş və arxeoloqlara lazımi məsləhətlər vermişdir. Ulu Öndər respublika ərazisində apardığı genişmiqyaslı quruculuq, inşaat işləri zamanı yeraltı və yerüstü tarixi abidələrin həssaslıqla qorunmasını və çox böyük məsuliyyətlə tədqiq olunmasını xüsusi diqqət mərkəzində saxlayırdı.

Hacıqabul-Mozdok qaz kəmərinin tikintisi zamanı, 1980-ci ildən etibarən tədqiq olunan orta əsr Şabran (keçmiş Dəvəçi) şəhərinin qazıntılarında memarlıq kompleksləri və zəngin maddi-mədəniyyət nümunələri aşkara çıxarıldı. Şabran şəhərindən Dərbənd istiqamətində gedən məşhur İpək yolu üzərində yerləşən qədim və orta əsr ticarət mərkəzlərindən biri olmuşdur. Bu şəhər haqqında yazılı mənbələrdə cuzi məlumat verilmişdir. Şəhərin yaranması və təkamülü tarixini araşdırmaq və kimlərə məxsus olduğunu müəyyənləşdirmək arxeoloji tədqiqatlar əsasında mümkün olacaqdı. Buna görə də Şabran şəhərinin tarixi və burada aparılan arxeoloji tədqiqatların nəticələri ulu öndər Heydər Əliyevi çox maraqlandırdı. Müdrik rəhbər Heydər Əliyev dünyanın müxtəlif ölkələrindən Azərbaycana gələn görkəmli tarixçiləri, səyyahları daim diqqət mərkəzində saxlamış, onların vasitəsilə də Azərbaycanın tarixi, mədəniyyəti, incəsənəti haqqında düzgün elmi məlumatların yayılmasına zəmin yaratmışdır.

Məşhur Norveç səyyahı və alimi Tur Heyerdal Qobustan abidələrini görmək məqsədilə Bakıya gələrkən Şabran arxeoloji qazıntılarının nəticələri haqqında da məlumat almışdır. Heydər Əliyev Tur Heyerdalı qəbul etmiş və bu görüşdə Şabran abidəsinin zəngin mədəniyyətindən bəhs olunmuşdur. Bu görüş zamanı Heyerdalın xahişi ilə Şabran qazıntılarından əldə olunan qlazur ornamentlərlə bəzədilmiş xeyli keramika nümunəsi (XII əsrə aid) Oslo muzeyinə Azərbaycan-Norveç mədəni əlaqələrini əks etdirən simvolik hədiyyə olaraq verilmişdir.

Moskvada SSRİ Nazirlər Soveti Sədrinin birinci müavini kimi çox çətin, məsuliyyətli rəhbər vəzifədə işlədiyi müddətdə Heydər Əliyev daim Azərbaycanın maddi-mədəniyyət abidələrini öz diqqət mərkəzində saxlamış, Şabran arxeoloji qazıntılarının nəticələri ilə maraqlanmışdır. 1983-cü ilin sentyabr ayında məzuniyyətdə olarkən, Şabran abidəsinə baxmağı qərara almışdır. Şabran arxeoloji ekspedisiyasının rəisi, görkəmli arxeoloq Rəşid Göyüşovun tədqiqat işlərini yüksək qiymətləndirmiş, qazıntılardan əldə edilmiş materialların sərgisinə baxmışdır.

Heydər Əliyevin Şabrana gəlişinin sədası tezliklə Quba, Xaçmaz, Qusar rayonları əhalisi arasında yayıldı. Onunla görüşmək üçüninsanlar axın-axın Şabran abidəsi qazıntılarınagəldilər.

Bu tarixi qaynaqları yüksək dəyərləndirən böyük öndər Heydər Əliyev demişdir: “Böyük və kiçikliyindən asılı olmayaraq, bütün abidələr diqqət mərkəzində olmalıdır. Abidələrin qorunması isə hamının, xüsusilə də rəhbər işçilərin diqqət mərkəzində olmalıdır”. Şabran qazıntılarına gələnlərdən bir nəfər yeraltından üzə çıxarılmış möhtəşəm qala divarlarını və zəngin arxeoloji materialları gördükdə tədqiqatçı

(Davamı 5-ci səhifədə)

(Əvvəli 4-cü səhifədə)

# Ulu öndər Heydər Əliyev Azərbaycanın tarixi mədəniyyət irsinin xilaskarıdır

R.Göyüşova müraciət edərək "buradan çoxlu qızıl tapırsınız" dedikdə Heydər Əliyev sərt və amiranə tərzdə demişdir; "Tariximiz üçün əhəmiyyət kəsb edən və yeraltından tapılmış hər bir xırda əşya belə qızıl qədər dəyərlidir".

Məlumdur ki, Azərbaycanın YUNESKO səviyyəsində tanınan dünya əhəmiyyətli Qobustan petroqlifləri, Naxçıvanda Memar Əcəminin tikdiyi Yusif İbn Kuseyr, Möminə Xatun türbələri, Əlincə qalası, Gəmiqaya piktoqrafik salnamələri, eləcə də Abşeronun-Bakının Qızqalası, Şirvanşahlar Sarayı kompleksi, Araz çayı üzərindəki Xudafərin körpüləri, Şirvan qalaları, Qəbələ, Gəncə, Bərdə və yüzlərlə belə möhtəşəm, bəşər tarixi üçün çox dəyərli abidələr Heydər Əliyevi daim düşündürürdü. Onun Şabranla maraqlanması isə təsadüfi deyildi.

Heydər Əliyev bütövlükdə Azərbaycan tarixinin ən qədim zamanlar və orta əsrlər dövrü ilə bağlı zəmanəmizə qədər açılmamış, qaranlıq qalan səhifələrinin öyrənilməsi barədə düşünür və bu mühüm problem məsələlərə cavablar verilməsi arzusu ilə yaşayırdı. Onu xalqımızın etnogenezi, bütövlükdə Cənubi Qafqazda minillər ərzində gedən tarixi etnik təkamül prosesləri, Azərbaycanın qədim və orta əsr dövlətlərinin mərkəzi şəhərlərinin mədəniyyəti, əhalinin demoqrafik artımı və etnik tərkibi xüsusilə maraqlandırırdı.

Geniş arxeoloji tədqiqatlar aparılan Şabran şəhər abidəsindən əldə edilən nadir maddi-mədəniyyət nümunələri məhz bu baxımdan maraq doğururdu. Görünür, Şabran adının özü etimaloji baxımdan Heydər Əliyevdə maraq doğurmuş və bu abidələrdən yazılı kitabələr çıxacağına ümid bəsləyirmiş. Yeri gəlmişkən, qeyd etmək lazımdır ki, Heydər Əliyev bütövlükdə Azərbaycanın epiqrafik abidələrinə böyük qayğı ilə yanaşırdı. Azərbaycanın tarixi qərb bölgələri (XX əsrdən Ermənistan adlanır)-İrəvan, Göyçə, Dərələyəz, Zəngəzur bölgələri ərazilərində ermənilər tərəfindən amansızca dağıdılıb məhv edilən tarixi abidələrin, Urud kəndinin Qoçdaş heykəlləri üzərindəki epiqrafik kitabələrin acınacaqlı taleyi onu daim narahat etmişdir.

Şabran etnotoponiminin şərhi bu şəhərin orta əsrlər dövrü əhalisinin etnik tərkibi, tarixi və linqvistik mənsubiyyətini müəyyənləşdirməyə imkan verir.

Böyük öndərHeydər Əliyevin tövsiyəsinə cavab olaraq Şabran abidəsi haqqında məlumatlar, materiallar toplamaq vacib oldu. Şabran adı yaşayış məskəni kimi 982-ci ildən xatırlanmışdır . Məlumata görə, bu yaşayış məntəqəsi 1711-ci ildə Hacı Davud tərəfindən dağıdılmışdır. Şabran toponimi mənbələrdə Şabiran, Sabiran, Sabran, Şabran, Şaburan, Şaparan şəklində qeyd olunmuşdur.

Bu toponimi türk mənşəli Sabir (Savar) tayfasının adı ilə əlaqələndirirlər. Sabirlər Xəzər dənizinin şimal-qərb sahilində yaşayan tayfalar olmuşlar. Ehtimala görə, əvvəllər Sibirdə İrtış çayı boyunda yaşamışlar. Bu xalq haqqında ilk dəfə yunan alimi Ptolomey (II əsr) məlumat vermişdir.

Mənbələrdə sabirlərin III əsrdən etibarən Cənubi Qafqaz və Ön Asiyaya hücumlar etdikləri haqqında məlumatlar var. Onlar 503-cü ildə Dərbənd keçidini aşaraq Azərbaycana hücum etmiş və 508-ci ilə qədər sasanilərlə mübarizə aparmışlar. 516-cı ildə sabirlər Ön Asiyaya daxil olmuşlar. Cənubi Qafqaz uğrunda döyüşlərdə gah İran, gah da Bizans tərəfindən vuruşmuşlar.

Türkdili avar xalqı ilə sabirlər arasında VI əsrin axırlarında vuruşlar olmuşdur. Sabirlər məğlub olduqdan sonra onların bir hissəsi Şimali Azərbaycana, ilk növbədə Quba, Xaçmaz və Dəvəçi-Şabran bölgələrinə köç edib məskunlaşmışlar.

Şübhəsiz ki, Heydər Əliyev bu qaynaqlardan xəbərdar idi və Şabran abidəsinin Sabir türk tayfaları ilə bağlı olduğunu bilirdi. O, bu cəsur türk nəsillərinin mədəni irsini əyani olaraq görmək üçün Şabrana gəlmişdi.

Heydər Əliyevin müstəqil Azərbaycan dövlətini qurduqdan sonra Prezident kimi fəaliyyəti zamanı tarix və mədəniyyət abidələrinə dövlət tərəfindən göstərilən qaygının yeni mərhələsi başlandı. Heydər Əliyev 1998-ci martın 21-də Novruz bayramı münasibətilə İçərişəhərin Qoşa qala qapıları qarşısındakı Gənclik meydanına gəlməsi, xalqla görüşdükdən sonra Şirvanşahlar Sarayını ziyarət etməsi əlamətdar tarixi bir gün oldu. Bu monumental memarlıq abidəsi kompleksini seyr edərkən Heydər Əliyev demişdir: "Əgər biz Şirvanşahlar Sarayını bərpa edib başa çatdırsaq, gələcək nəsillər üçün böyük işlər görmüş olarıq. Onlara böyük hədiyyə vermiş olarıq".

Heydər Əliyev İslam mədəni-mənəvi irsi ilə bağlı tariximizi çox yüksək qiymətləndirir və bununla əlaqədar müqəddəs sayılan tarixi abidələrə böyük qayğı göstərirdi. Heydər Əliyev bir çox mədəniyyət abidələrini əvvəlki memarlıq planında və əzəmətli görünüşdə yenidən bərpa və inşa etdirərək xalqa qaytarmaqla, onu daha da inamlı və güclü etdi.

Bakıda 1934-cü ildə dağıdılmış Bibiheybət türbəsi və 20 metr hündürlüyündə minarəsi olan məscidin (XIII əsr) yenidən tikilib xalqa qaytarılması və İçərişəhərin bütövlükdə qoruq olması haqda prezident sərəncamı verilmişdir.

Ulu öndər Heydər Əliyev Azərbaycanın tarixi abidələrinə böyük qayğı göstərməklə milli mədəniyyətimizin və mənəviyyatımızın qorunaraq gələcək nəsillərə dəyərli irs olaraq saxlanılmasının təməlini qoymuşdur.

Böyük öndər Heydər Əliyevin mənəvi baxışları və qayğısı ilə qorunan tarixi abidələr xalqımızın, xüsusilə gənc nəslin torpağa, mədəni irsə bağlılığını təmin edir və vətənpərvərlik ruhu aşılayır.

**Vəli Əliyev,**
**ADPU-nun Ümumi tarix kafedrasının müdiri,**
**AMEA-nın müxbir üzvü,**
**tarix üzrə elmlər doktoru,**
**professor**

# HƏR BİRİMİZİN VƏTƏNDAŞLIQ BORCU

Bu borc İlahidən, haqdan çiyinlərimizə yazılıb, hisslərimizin, duyğularımızın təlqini ilə bir öhdəlik kimi boynumuza qoyulub. Əlbəttə, söhbət cəmiyyətin sağlam üzvlərinin çiyinlərinə İlahidən qoyulan öhdəlikdən gedir. Hansı ki, "vətəndaş" anlamını səciyyələndirən əsas xüsusiyyətlərdən biridir.

İnsanpərvərlik, xeyirxahlıq əlillərə, qocalara, imkansızlara, şəhid ailələrinə əl tutmaq, qaçqın və məcburi köçkünləri daim diqqətdə saxlamaq kimi yüksək insani xüsusiyyətlər daim ümummilli lider Heydər Əliyevin diqqət mərkəzində olub. Bütün bunlar ulu öndər Heydər Əliyevin əməli fəaliyyətinin parlaq görünən xüsusiyyətlərindən idi. Ümummilli Lider deyirdi: "Əmin olduğumu bildirmək istəyirəm ki, Azərbaycan Qızıl Aypara Cəmiyyəti öz imkanlarından daha geniş istifadə edərək müstəqil Azərbaycanın sosial və insani problemlərinin həlli istiqamətində aparılan işlərdə dövlətin ən yaxın köməkçisinə çevriləcəkdir". 1994-cü ildə imzaladığı sərəncamla Azərbaycan Qızıl Aypara Cəmiyyətinin (AQAC) Azərbaycan dövləti tərəfindən rəsmən tanındığını və yeni inkişaf yoluna qədəm qoyduğunu bəyan etməklə isə öz xalqının qürur ünvanı olan ulu öndər Heydər Əliyev xalqımızın milli mentalitetinə, başqa sözlə,milli mənəvi-əxlaqi dəyərlərimizə sədaqətini bir daha nümayiş etdirmiş oldu.

Müsbət bir haldır ki, AQAC bu gün istedadlı şair və bəstəkar, millət vəkili Novruz Aslanın rəhbərliyi ilə öz üzərinə düşən vəzifələri uğurla yerinə yetirir. Hazırda AQAC-ın ölkədə xüsusi fəallığı ilə seçilən qurumlarından biridə ADPU-da fəaliyyət göstərən bölməsidir. Bölmə Musiqi fənləri və onların tədrisi metodikası kafedrasının müdiri, professor Jalə Qədimovanın sədrliyi ilə 2009-cu ilin yanvarından yeni tərkibdə fəaliyyət göstərir. Ötən 4 ildən artıq dövrdə bir sıra aksiyalara-könüllü qanvermə, QİÇS əleyhinə və s. aksiyaların keçirilməsində xüsusi fəallıq nümayiş etdirib. ADPU-da yardıma ehtiyacı olan müəllim və tələbələrə, uzun illərpedaqoji fəaliyyətdən sonra artıq pensiyada olan universitet müəllimlərinə qayğı göstərilməsi kimi bir məsələdə daim AQAC-ın ADPU bölməsinin diqqət mərkəzindədir.Bu isə təbii ki, ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədovun şəxsən özünün təbiət etibarilə xeyirxah, nəcib insan olmasından irəli gəlir. Yusif müəllim üçün təhsilin keyfiyyəti ilə yanaşı, insan haqlarının qorunması, universitetin tələbə və müəllimlərinin, əməkdaşlarının qayğı ilə əhatə olunması hər zaman ön plandadır. Bu insani keyfiyyətlərin nəticəsidir ki, AQAC-ın universitet bölməsinin sədri Jalə Qədimova ümummilli lider Heydər Əliyevin 90 illik yubileyinə həsr olunan bir sıra xeyirxah aksiyalar keçirmək barədə niyyətini açıqlayanda bu təşəbbüs rektor Y.Məmmədov tərəfindən rəğbətlə qarşılanıb.

İlk addım fevral ayının 7-8-də cari tədris ilinin əvvəllərində pensiyaya çıxmış ADPU əməkdaşlarını - Ulu Tanrı verən ömrünün yarım əsrini ADPU ilə bağlamış Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının baş müəllimi Nahidə Əfəndiyevanı, Mülki müdafiə və tibbi biliklərin əsasları kafedrasının baş müəllimi Firəngiz Rəhimova və Kimya fakültəsində öncə baş laborant, sonra uzun illər laboratoriya müdiri çalışmış Şəfiqə Eldarovanı ziyarət etmək oldu.



Aksiyada AQAC-ın universitet bölməsinin sədri, professor Jalə Qədimova, Pedaqoji fakültənin dekan müavini, bölmənin fakültə üzrə sədri, dosent Afət Həsənova, Azərbaycan dilçiliyi kafedrasının dosenti, bölmənin Filologiya fakültəsi üzrə sədri Həcər Hüseynova, Musiqi fənləri və onların tədrisi metodikası kafedrasının baş müəllimi Arifə Qəribova, həmin kafedranın müəllimi, bölmənin üzvü Firəngiz Hidayətova, Biologiya və onun tədrisi metodikası kafedrasının müəllimi, bölmənin Biologiya fakültəsi üzrə sədri, İmran Kazımov iştirak edirdilər. Veteran müəllimlərə AQAC tərəfindən pul və hədiyyələr verildi.



Veteran müəllimlər tərəfindən kövrək duyğularla müşayiət olunan bu görüş, inanıram ki, hələ uzun müddət yaddaşlarda yaşayacaq.

AQAC-ın universitet bölməsinin sədri,professor Jalə Qədimova universitetin rektoru, professor Yusif Məmmədovun veteran müəllimlərə salamlarını, eləcə də xoş arzularını onlara çatdırdı, hər birinin çalışdığı kollektiv arasında yerinin bu gün də göründüyünü söylədi.

Nahidə xanım Əfəndiyeva dedi: "Allah sizi sevindirsin, bu gəlişiniz məni yaman kövrəltdi. Sizi də kövrəltmək istəmədiyimdən özümü tox tutmağa çalışıram. Tanrı sizi qorusun! Pensiyaya çıxmağım səhhətimlə bağlı və həyat yoldaşımın təkidi ilə oldu. Mən Yusif müəllimdən bir rəhbər kimi çox razıyam. Müəllimlik - gözəl sənətdir. Onun qədrini bilin. Həyatda ən əsası təmizlikdir, vicdanlı yaşamaqdır. "Müəllim" adının şərəfini, "insan" adının ləyaqətini qoruyun. İnsan - insana qarşı diqqətli, ehtiramlı olmalıdır. Mən bu diqqət və ehtiramı rektor Yusif Məmmədovdan görmüşəm, bu gün illərlə üzvü olduğum kollektivdən bir daha gördüm. Bu qayğı və diqqətə görə Yusif müəllimə, eləcə də sizə öz təşəkkürümü bildirirəm".

Bu görüş-aksiya qonağı olduğumuz veteran müəllimlərimizi tanımayanlar üçün həm də tanımaq imkanıdır. Məlumat üçün bildirək ki, Nahidə Əfəndiyeva 1957-ci ildə ADU-nu (indiki BDU-nu) fərqlənmə diplomu ilə bitirib. Bir il Oğuz rayonunda, dörd il Qəbələ rayonunda müəllim işləyib. 1962-ci ildən sonrakı taleyi öncə aspirant, sonra müəllim olmaqla APİ (indiki ADPU) ilə bağlıdır.



Firəngiz Rəhimova isə görkəmli xalq yazıçısı Süleyman Rəhimovun gəlinidir. Qayını mərhum Şamo Rəhimovdan, həyat yoldaşı mərhum Oqtay Rəhimovdan, onun bu ali məktəbə həsr etmiş olduğu "APİ, ad günün mübarək!" şeirindən söz açdı, yoldaşının ölümündən sonra onun ildönümünə yadigar olaraq nəşr etdirdiyi "Şərəfli ömür yolu" şeirlər kitabını rektor Y.Məmmədova hədiyyə göndərdi. Qayğı və diqqət göstərdiyinə görə rektor Y.Məmmədova, AQAC-ın universitet bölməsinin sədri, professor J.Qədimovaya, bölmənin Biologiya fakültəsi üzrə sədri İ.-Kazımova, həmçinin fakültənin professor-müəllim heyətinə minnətdarlığını bildirdi. Həyat üçün, insanlar üçün xoş arzularını ifadə etdi: "Həmişə dua edirəm ki, Allah, cavanlara kömək ol, xalqımızı, millətimizi qoru, qalan hər şey keçərlidir" dedi.

1961-ci ildən taleyini ADPU-nun Kimya fakültəsi ilə bağlayan Şəfiqə Eldarova da gəlişimizdən məmnun qaldığını söylədi: "Bu gəlişinizlə mənə bir dünya ömür yaşatdınız. Doğma kollektiv tərəfindən belə qayğı, diqqət görmək çox xoşdur. Gələn ayaqlarınız var olsun! Özümü yenidən doğma kollektivdə, iş yoldaşlarımın arasında hiss etdim. Onu da bilin ki, bu gəlişinizlə biz ağbirçəklərə təzə nəfəs, təzə ömür bəxş edirsiniz".

***

...İnsana həyatda unudulmadığı, onu tanıyıb- bilənlər üçün həmişə gərəkli olduğunu hiss etdirməkdən gözəl duyğu varmı?! Özlüyümüzdə bu ziyarətdən hamımız məmnun qaldıq. Ən azından universitetin üç ağbirçək əməkdaşının bir günlük də olsa xoş duyğular yaşamalarına şahidlik etdiyimizə, ürəklərində təzə nur, təzə şöləli işıq yandırdığımıza görə.

**Qələmə aldı:**
**Ayətxan İSGƏNDƏROV**

# Xocalı soyqırımı:
## ötən əsrin əvvəllərindən başlanan qətliamın finalı

XX əsrdə Azərbaycan xalqının başına gətirilən ən dəhşətli faciələrdən biri 1992-ci ilin fevralında törədilən Xocalı soyqırımıdır. Erməni qaniçənləri Rusiyanın Xankəndidəki 366-cı mexanikləşdirilmiş motoatıcı alayı ilə birləşərək XX əsrin Xatın, Sonqımı faciələrindən daha dəhşətli soyqırımı törətdilər.

1992-ci il fevralın 25-də, saat 2100-da erməni hərbi birləşmə-lə-ri, 1890 nəfər şəxsi heyəti olan 366-cı motoatıcı alay, habelə xaricdən gətirilmiş muzdlular Xocalıya hücum etdilər. Hava limanına zərbələr vurulsa da, şəhərin müdafiəçiləri-Xüsusi Təyinatlı Milis Dəstəsinin rəisi, milis ma-yoru Əlif Hacıyev və onun 22 nəfərlik dəstəsi mərdliklə müdafiə olu-n-dular. Bu qeyri-bərabər döyüşün nə ilə nəticələnəcəyini yaxşı başa düşən Ə.Hacıyev hava limanının dispetçer məntəqəsini partlatdı və qəhrə-manlıqla həlak oldu. Ölümündən sonra ona "Azərbaycanın Milli Qəhrəmanı" fəxri adı verilmişdir.

Düşmən tankları və zirehli maşınları artilleriya hazırlığından sonra Mehdikənd, Qərargah və Daşbulaq tərəfdən Komandiri mayor Ohanyan olan ikinci, komandiri mayor Nabodixın olan üçüncü motoatıcı tabor, topçu diviziyası, Lixodeyanın rəhbərliyi altında D-3 topu xüsusi vəhşilik göstərdilər.

Düşmən alaylarına qarşı qeyri-bərabər döyüşdə Tofiq Hüseynovun taboru xüsusi mərdliklə vuruşdu. Son gülləsini özünə vuran Tofiq Hüseynov da ölümündən sonra "Azərbaycanın Milli Qəhrəmanı" fəxri adına layiq görülmüşdür.

Düşmən əsgərləri müxtəlif istiqamətlərdən Xocalıya soxula-raq şəhəri yandırmışdılar. Müdafiəsiz qalan şəhər əhalisi-əsasən qadınlar, uşaq-lar və qocalar Ağdam istiqamətinə üz tutmuş, əhalinin bir his-səsi qarlı-şaxtalı gecədə həlak olmuş, sağ qalanlar səhərisi gün Qaraqaya adlı yerdə pusquda dayanan erməni əsgərlərinin gülləsinə tuş gəlmişdilər.

Xocalıda azərbaycanlılara qarşı soyqırımı törədilmişdir. 613 nəfər, o cümlədən 106 qadın, 83 azyaşlı uşaq, 70 qoca öldürülmüş, 1000-dən artıq dinc sakin şikəst olmuş, 1.275 nəfər əsir götürüldmüş, 8 ailə tamamilə məhv edilmiş, 56 nəfər diri-diri yandırılmşdır.

Xocalı faciəsi respublikada böyük əks-səda doğurmuş, siyasi gərginliyə səbəb olmuşdur.

Bu, rəsmi statistika. Bəs əslində vəziyyət necədir?

Faktlara nəzər salaq:

Dağlıq Qarabağın bombalanmasında, yaşayış məskənlərinin viran qoyulmasında Tsinvali və Telavi vertolyot bazaları yaxından iştirak etmişdir. Zaqafqaziya Hərbi Dairəsinin generalı Valeri Pasrikyevin sərəncamına əsasən burada təşkil olunmuş xüsusi kurslarda vertolyotları idarə edəcək 16 erməni pilotu hazırlanmışdır. Kurs müdavimləri arasında milliyyətcə ərəb olan və «Həmas» terrorçu təşkilatından qovulmuş Zahid əl-Məhəmməd adlı birisi də olmuşdur. Telavidə çıxan «Eskadrilya» qəzeti 1992-ci il 20 fevral tarixli sayında yazırdı ki, 1992-ci il fevralın 12-də və 16-da Rusiya Federasiyasının Prezidenti B.Yeltsin Telavi vertolyot bazasında kursu bitirmiş erməni pilotlarına yeni və dəqiq hərbi uçuşa malik «Mi-24 P» markalı vertolyotların verilməsi haqqında 7-ci ordunun Baş komandanı, general-mayor Reuta göstəriş vermişdir. Polkovnik Leonid Kapralovun başçılığı ilə iki «Mi-8» vertolyotu Gəncə vertolyot zavo-



dunda təmir olunmuşdur. Beləliklə, Xocalı istiqamətində hərbi hazırlığın təməli qoyulmuş, Dağlıq Qarabağ istiqamətində döyüşə hazır vəziyyətdə dayanmış vertolyotlar üçün Bakıdan 200 ton yanacaq alınmışdır. Fevralın 17-də Zori Balayan Telavi hərbi bazasında ermənilərlə görüşmüş, fevralın 19-da general Reut Moskvanın 17 fevral tarixi sərəncamına əsasən 16 erməni üçün 9 müxtəlif markalı hərbi vertolyot ayırmış və fevralın 22-də həmin vertolyotlar 366-cı alayın tərkibinə daxil edilmişdir. Vertolyotların pilotları Livan, Suriya və İrəvan erməniləri, eyni zamanda yuxarıda qeyd etdiyimiz Zahid Əl-Məhəmməd idi. Moskvanın razılığını almaq üçün ermənilər hiyləyə əl ataraq Kremlə qızışdırıcı teleqramar göndərmişlər. Rusiya Prezidenti B.Yeltsinə general O.Sarkisyan və polkovnik Ter-Qriqoryan tərəfindən 25 fevralda vurulan teleqramda bildirilirdi ki, « respublikanın yüksək çinli təhlükəsizik əməkdaşları təsdiq edirlər ki, son günlərdə 4 tam diviziya və 7 briqadadan ibarət türk hərbi qüvvələri Ermənistanla sərhəddə toplaşmışdır. Ordu İkinci Dünya müharibəsi dövründə müşahidə olunmayan hərbi döyüş hazırlığına gətirilmişdir».

Tarixi cinayəti hazırlayanlar teleqramı Yeltsinin başçılıq etdiyi Təhlükəsizlik Şurasının iclası üçün hazırlamış və iclasa Ermənistan prezidentinin təhlükəsizlik məsələləri üzrə müşaviri Aşot Manuçaryan dəvət olunmuşdur. Manuçaryan müşavirədəki çıxışında gələcək planlarının bir hissəsini dolayısı ilə ifadə edərək bildirmişdir ki, «Yaxın vaxtlarda Türkiyə Azərbaycanın xahişi ilə Qarabağ konfliktinin həlli məqsədilə köməyə gələ bilər. Bu, Ermənistanla sərhədi pozmadan Azərbaycanla Naxçıvan arasında olan 9 kilometrlik ümümi sərhəddə baş tuta bilər. Ermənistan ərazisinin pozulması da istisna deyildir». Deməli, Naxçıvanla Azərbaycanı birləşdirən sərhəddin ələ keçirilməsi gələcək planın tərkib hissəsi idi.

Xocalıya ilk raket fevralın 25-də, saat 1600-da Zahid Əl-Məhəmməd tərəfindən atmılşdır. Xatırladaq ki, atılan hər raket üçün 280 dollar mükafat müəyyənləşdirilmimşdir. Döyüşdə fərqləndiyi üçün Zahid Əl -Məhəmməd və Suren Pirimyan «Qızıl xaç» ordeni ilə təltif olunmuşlar. Zahid Əl-Məhəmməd martın 3-də həlak olmuş, müdafiə naziri, indiki prezident Serj Sarkisyanın göstərişi ilə İrəvanda Erablur hərbi qəbiristanlığında dəfn olunmuşdur.

Xocalı soyqırımında rus və erməni zabitləri iştirak etmişlər. Doğrudur, soyqırımı iştirakçılarına dair sənədlər 1992-ci il martın 1-də Zaqafqaziya Hərbi Dairəsinin aviasiya komandanı, general-mayor Lukaşovun əmri ilə yandırılmışdır. Ancaq polkovnik V.Saveleyevin «Məxfi» arayışında meyitləri yığıb yandıran, azərbaycanlı əsirləri sıraya düzüb gülləleyən və bundan həzz alan rütbə sahiblərinin, əsgəri şərəfi ləkələyən 41 nəfər erməni və rus zabitlərinin adları vardır: Birinci batalyon komandiri, polkovnik Moiseyev, II batalyon komandiri, mayor S.Ohanyan, III batalyon komandiri, mayor E.Nabokix və başqaları. Soyqırımında xüsusi vəhşilikləri ilə seçilənləri mükafatlandırmışlar. Onlardan 13 nəfərlik Babayevlər ailəsini məhv etdiyi üçün Çitçiyana Fransa erməni disporu tərəfindən 150 min dollar pul və «Kilsə mükafatı», rus zabiti Yevgen Qolubevə üstündə ASALA yazılmış 25 qramlıq qızıl orden və 5 min dollar, Anastas İvanova 10 min dollar və «Hunday» markalı maşın verilmişdir.

Xocalı soyqırımı haqqında dünya ictimaiyyətinə yalan məlumatlar verilmişdir. Lakin bəzi mətbuat orqanları faciənin ermənilər və onlara yardım edən 366-cı motoatıcı diviziya tərəfindən həyata keçirildiyini yazmışlar. «Sandi Tayms» qəzeti (Böyük Britaniya) 1 mart 1992-ci il tarixli sayında erməni əsgərlərinin minlərlə ailəni məhv etdiyi, «Faynenşl Tayms» qəzeti (Böyük Britaniya) 9 mart 1992-ci il tarixli sayında ermənilərin Ağdama tərəf gedən dəstəni güllələdiyini, 1200-ə qədər azərbaycanlını məhv etdiyini yazmışlar.

«Tayms» və «İzvestiya» (Rusiya) qəzetləri 4 mart 1992-ci il tarixli nömrələrində, «Le Mond» qəzeti (Fransa) 14 mart 1992-ci il tarixli sayında erməni vəhşiliyndən bəhs edərək qətlə yetirilənlərin başlarının kəsildiyini, kişilərin skalplarının soyulduğunu qeyd etmişlər.

«Faynenşl Tayms» qəzeti 14 mart 1992-ci il nömrəsində general Polyakova istinadən 366-cı alayın tərkibində 103 nəfər erməni hərbçisinin olduğunu yazmışdır.

«Varel aktuel» jurnalı (Fransa) 14 mart 1992-ci il nömrəsində erməni silahlı dəstələrinin tərkibində Yaxın Şərqdən çıxmışların, ASALA-nın Suriya və Livandan olan hərbçilərinin iştirak etdiyini təsdiqləmişdir.

Yalanın ömrü uzun olmaz demişlər. Hadisə yerində olan İngiltərənin «Fant men nyus» teleşirkətinin jurnalisti R.Patrik yazmışdır: "Xocalıdakı vəhşiliklərə dünya ictimaiyyəti heç nə ilə haqq qazandıra bilməz".

Xocalıdakı soyqırımını ört-basdır etmək üçün ermənilər meyitləri yandırmış, sağ qalanlara işgəncələr verimişlər. Əlimizdə olan sənədlər Xocalı ərazisində - Xanabadla Daşbulaq kəndləri arasında ilk «səyyar ölüm ocaqları»nın fevralın 28-də təşkil olunduğuna və bu prosesdə 366-cı alayın komandanı Yuri Zarviqarovun əsgər və zabitlərinin iştirak etdiyinə şəhadət verir. Daud Xeyriyan Beyrutun «Əş-Şərq» nəşriyyatında çapdan çıxan «Xaç uğrunda» kitabında Xocalı faciəsindən bəhs edərək yazır: «

Bəzən çaşıb ayağımızı meyitlərin üstünə qoyaraq, keçib gedirdik. Daşbulaq tərəfdəki bataqlıqdan keçmək üçün ölənləri yanaşı düzüb yol düzəltdik. Ayağımı ölənlərin üstünə qoyub getmək istəmədim. Polkovnik Ohanyan mənə işarə etdi ki, qorxmayım. Müharibənin qanunlarından biri də budur. Mən ayaqlarımı sir-sifəti qana bulamiş 9-10 yaşlı bir qızın sinəsinə sıxıb irəli addımladım    Ayaqlarım, fotoaparatım qan içində idi».

Daha sonra erməni jurnalist yazır: «Martın 2-də ermənilərin «Qaflan» qrupu 100 nəfərdən artıq türk meyitini yığıb Xocalıdan təqribən bir kilometr qərb istiqamətində yandırdı   Sonuncu maşında təqribən 10 yaşında olan bir qız uşağı da gördüm. O, alnından və qollarından yara almışdı. Sir-sifəti göyərmiş bu uşaq hələ ölməmişdi. Aclığa və soyuğa, aldığı yaralara baxmayaraq, ölməmişdi. Asta-asta nəfəs alırdı. Ölümlə çarpışan bu uşağın gözlərini unuda bilmirəm   Bir azdan onu da «Qaflan» çıların «səyyar ölüm ocaqları» nda yandıracaqdılar. Heysiz-hərəkətsiz uzanmış, dırnaqlarından qan süzülən bu uşağı Tiqranyan çağırılan bir əsgər tolazlayıb, qalaqlanmış meyitərin üstünə atdı

Sonra bu insan qalağına od vurdular. Bu zaman elə zənn etdim ki, yanan meyitlərin içərisində kimsə qışqırır, aman və imdad diləyir   Onlar isə xaç uğrunda döyüşlərini davam etdirirdilər»

Erməni hərbi birləşmələri təkcə insanları qətlə yetirməklə kifayətlənmədilər. Onlar həm də nüvə silahını sınaqdan keçirmişdilər. «Bundesver» qəzeti 1992-ci il 7 may tarixli, «İzvestiya» qəzeti isə 13 may tarixli nömrəsində yazır ki, fevralın 25-də Azərbaycanın Xocalı şəhərinə Xankəndindən 122 mm-lik sionid başlıqlı mərmi atılmışdır. Erməni terrorçuları Qarabağı narkotik bitkilərin əkin yerlərinə çevrmişlər. Burada «Qara bant» çılar, ASALA qrupunun terror-təlim düşərgələri, «Emissar» lar üçün mərkəz, reabilitiasiya mərkəzi, informatorlar qrupu, hərbi sursat mərkəzi, kimyəvi preparatlar üçün «Restisid» anbarı, kəşfiyyatın «Elektron» mərkəzi, poçt kommunikasiyası, «Hay Dad» və «Evkara» mərkəzləri, «Mücahidlər, «Kilsə» qərargahdarı, «Çeqakron» terror təşkilatı, elmi-tədqiqat mərkəzləri, bioloji silahlar üzrə laboratoriyalar yaradılmışdır. Elə isə dünya bunları billə-bilə niyə 100 il bundan əvvəl ermənilərin soyqırımına məruz qaldıqlarını subut etmədən qərarlar qəbul edir, insan azadlıqları və hüquqlarına zidd olaraq hətta erməni soyqırımını inkar edənlərə cəza müəyyənləşdirir, amma 21 il bundan əvvəl baş verən həqiqəti inkar edirlər. Bu suala cavab 366-cı alayın komandiri Yuri Zarviqarovun zabitlər qarşısındakı çıxışında dəqiq ifadə edilmişdir. 1992-ci il fevralın 24-də, saat 2115-də general rütbəsi alan zabit çıxışında demişdir: «Regiondakı müharibə torpaq müharibəsi yox, İslamın xristianlığa qarşı müharibəsidir».

Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi zamanı 20 mindən artıq soydaşımız şəhid olmuş, 60 mindən artıq Azərbaycan övladı yaralanmış, şikəst olmuşdur. Bir milyondan artıq soydaşımız doğma yurd-yuvalaırndan didərgin salınmışdır. Münaqişənin sülh yolu ilə həllində ümummilli lider Heydər Əliyev tərəfindən atılan mühüm addımlar, Ulu Öndərin siyasi kursunu uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin münaqişənin sülh yolu ilə həll edilməsi sahəsindəki fəaliyyəti xalqımız tərəfindən bəyənilir və dəstəklənir. Ancaq ölkə başçısının dəfələrlə qeyd etdiyi kimi, münaqişə ancaq ölkəmizin ərazi bütövlüyü, suverenliyi əsasında həll edilə bilər. Yurdyuvalarından didərgin salınmış soydaşlarımız yerlərinə qayıtmalı, ata-baba torpaqlarının sahibi olmalıdırlar. Bütün bunları xalqımız bilir və qiymətləndirir. Ən başlıcası, ona görə ki, erməni separatçılarına qarşı mübarizədə həlak olmuş insanların xatirəsi bunu bizdən tələb edir. Onların həyat və döyüş yolu nəinki indiki nəsillərə nümunədir, həm də gələcək nəsillərin qürur, iftixar mənbəyinə çevriləcəkdir.

**Mais Əmrah,**
**Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru, tarix üzrə elmlər doktoru**

# Şair sözünə, musiqi çələnginə bəzənmiş görüş

## Bakıdakı 52 saylı tam orta məktəbdə sözün, ədəbiyyatın bayramı

Azərbaycanın tanınıb-sevilən söz ustadlarından olan Zahid Xəlil və Rafiq Yusifoğlu ilə Bakı şəhərinin Yasamal rayonundakı 52 saylı tam orta məktəbdə fevral ayının 13-də ADPU-nun pedaqoji təcrübə keçən Manafova və həmin qrupun pedaqoji təcrübə rəhbəri Tənzilə Əliyeva mənə belə bir təkliflə müraciət etdilər. Bu, məni sevindirdi.Ədəbiyyata marağı olan fəal şagirdlərimizi, bədii özfəaliyyət dərnəyinin kollektivini bu



Filologiya fakültəsinin qiyabi şöbəsinin V kursunda təhsil alan tələbələrin təşəbbüsü ilə ərsəyə gəlmiş görüşdə fakültənin müəllimləri, tələbələr və məktəblilər iştirak ediblər.

Tədbiri giriş sözü ilə məktəbin direktoru Elmira Ələsgərova açaraq Pedaqoji Universitetlə 52 saylı tam orta məktəb arasında mövcud olan xoş münasibətlərdən, pedaqoji ələqələrin ildən-ilə daha da genişlənməsindən danışıb: "Mən ADPU-nun məzunuyam. Burdakı əmək stajım məktəbimizlə yaşıddır: 48 il! Öncəuşaq birliyi təşkilatçısı,sonra məktəbin tərbiyə işləri üzrə direktor müavini işləmişəm.

Bu illər ərzində ADPU-dan məktəbimizə pedaqoji təcrübəyə çoxlu sayda tələbə və onlara rəhbərlik edən müəllimlər gəlib. Məktəbdən razı qaldıqları üçün bu ənənə indi də davam edir. Lakin bu illər ərzində heç kəsdən hər hansı bir şair, yaxud yazıçı ilə, tanınmış, görkəmli şəxsiyyətlərlə görüş keçirmək haqqında təklif almamışdım. İlk dəfə idi ki, Pedaqoji Universitetin Filologiya fakültəsinin 503-cü qrup tələbəsi Reyhan görüşə cəlb etdim. Birgə işimizin nəticəsi uğurlu alındı".

Sonra söz aparıcılara verildi. Məktəblilər aparıcıların - 503-cü qrupun tələbələri Reyhan Manafova ilə Süreyya Babayevanın çıxışlarından öyrəndilər ki, şeirləri nəğmələrə çevrilən şair, "Qızıl qələm" mükafatı laureatı, publisist, tərcüməçi, filologiya üzrə elmlər doktoru, ADPU-nun Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının müdiri, Əməkdar müəllim, professor Zahid Abdulla oğlu Xəlilov 1942-ci il mart ayının 20-də Yevlax şəhərində anadan olub, orta təhsilini Yevlax şəhərindəki M.Ə.Sabir adına 2 saylı məktəbdə alıb. İlk şeirini 6-cı sinifdə yazıb. "Vətənim" adlı şeiri X sinifdə oxuyarkən çap olunub. ADU-nun (indiki BDU-nun) Jurnalistika fakültəsini müvəffəqiyyətlə bitirən Z.Xəlil sonralar müxtəlif mətbuat orqanlarında ədəbi işçi, məsul katib, redaktor vəzifələrində çalışıb. Bədii və elmi yaradıcılıqla müntəzəm məşğul olmuş, 1969-cu ildə "Uçan çıraqlar" adlı ilk şeirlər kitabı ilə ədəbiyyata gəlmişdir. Şairin yaradıcılığında doğma Azərbaycanımızın çayları, meşələri, bulaqları məhəbbətlə tərənnüm edilir.

Rafiq Yusifoğlu isə Azərbaycanın cənnət guşələrindən olan Qubadlıda dünyaya göz açıb. Dağların havası, bulaqların zümzüməsi, kəkliklərin, turacların nəğməsi, Ağaçayının, Bərguşadın laylası Rafiq müəllimin ürəyini şeirə, sənətə məhəbbət ruhunda kökləyib. Bir tərəfdən qoynunda böyüdüyü təbiətin gözəlliyi, digər tərəfdən isə oxuduğu kitablar yeniyetmə Rafiqin ürəyindəki poetik qığılcamları alova çevirib. Şeirləri hələ orta məktəbdə oxuyarkən dövri mətbuatda çap olunub. ADPU-nun Filologiya fakültəsində ali təhsilini başa çatdırandan sonra müəllim işləyib.Ancaq harada olur-olsun, ədəbiyyatla sıx bağlı olub. İstər şeir sahəsində, istərsə də uşaq ədəbiyyatında yaddaqalan uğurlar qazanıb.





Tədbirdə Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov, dekan müavini, dosent Pəri Paşayeva, ədəbiyyatşünas, dosent Füzuli Əsgərli, o cümlədən məktəblilərin görüşünə gəlmiş Z.Xəlil ilə R.Yusifoğlu çıxış edərək tələbələrin təşəbbüsünə dəstək olaraq bu şəraiti yaratdığına görə məktəbin direktoru E.Ələsgərovaya və məktəbin pedaqoji kollektivinə minnətdarlıqlarını bildirmişlər.

Sonra Z.Xəlil və R.Yusifoğlundan bəhs edən videoçarx nümayiş etdirilib, şairlər məktəbliləri maraqlandıran sualları cavablandırmış, uşaqlara həsr etdikləri şeirləri oxumuşlar.

Tələbələrdən Sevinc Abbasova ilə Zümrüd Hüseynovanın, məktəblilərdən Ulduz, Minarə Əliyeva, Şəfəq İsmayılzadə, Təhmiraz Abbasov və Fatimə Yəhyayevanın, Nigar Əlizadə, Şahnaz və Nəcibə Əliyevaların, Oruc Tarverdiyev, Lolita Qasımova, Züleyxa Ağamalıyeva, Hüseyn Rzaquluyev və Rüstəm İsmayılovun ifasında şairlərin şeirlərindən nümunələr səsləndirilib.

Tələbə Reyhan Manafovanın müəllifi olduğu şeir tədbir iştirakçıları tərəfindən alqışlarla qarşılanıb. Həmin şeiri oxuculara təqdim edirik.

### DƏNİZ

Dəniz mənim həyatımın sirli,
şirin arzusudur,
Bərəkəti, ruzusudur,
Mən dənizi çox sevirəm.

Sevirəm mən göy Xəzəri,
rəqs eyləyən dalğaları,
Dalğalanan göy suların üstə
çıxan qayaları.
Sanki onlar məni səslər.
Bu ləpələr
Qəlbimdəki arzuları mənə verər.
Mənsə sakit
bu səsləri dinləyirəm,
Ürəyimdən gələnləri söyləyirəm -
Mən dənizi çox sevirəm!
Sanki məni
könlümdəki arzulara aparır o.
Ürəyimdən gizli bir səs qoparır o.
Sanki məni
qəlbimdəki məhəbbətə səsləyərək
Deyir, tez gəl,
gözlədiyin məhəbbətin də gələcək.
Alır məni dalğaların ağuşuna.
Aparır o
bu qəlbimin yarı qalan arzusuna -
Mən dənizi çox sevirəm!
Mən dənizi çox sevirəm!

* * *

...İki saatdan çox davam edən görüşdə məktəblilərin şairlərə ünvanladıqları suallar, alınan cavablar, şagirdlərin ifasında oynanılan rəqslər tədbir iştirakçıları tərəfindən rəğbətlə qarşılandı.

A. ZİYATXANOĞLU

# TGT-nin sədri Mahmud Möhbalıyev "İlin ən yaxşı təşkilatçısı" mükafatına layiq görülüb




İlk olaraq onu qeyd edək ki, 1996-cı il fevral ayının 1-də respublikamızda ilk dəfə Azərbaycan Gənclərinin I Forumu keçirilib. Ulu öndər Heydər Əliyevin 1997-ci ildə imzaladığı müvafiq sərəncamla isə Azərbaycanda fevralın 1-i "Gənclər günü" elan edilib. Bu, ulu öndər Heydər Əliyevin gəncliyə göstərdiyi xüsusi diqqət və qayğının bariz nümunəsi idi. Hazırda gənclərə bu qayğı və diqqət Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən yüksək səviyyədə davam etdirilir.Onu da qeyd edək ki, "Gənclər günü" MDB məkanında və eləcə də Şərqi Avropa ölkələri arasında ilk dəfə Azərbaycanda keçirilib. Məhz bundan sonra MDB-nin digər ölkələrində və Şərqi Avropa dövlətlərində bu gün qeyd olunmağa başlanmışdır. Azərbaycanda hər il keçirilən "Gənclər günü"ndə bütün istiqamətlər üzrə fəaliyyət göstərən gənclər təşkilatları hesabat verirlər.

Səbail Rayon İcra Hakimiyyətinin (RİH) təşəbbüsü və təşkilatçılığı ilə fevralın 1-də "Gənclər günü" münasibəti ilə "Crystal hall" da yüksək səviyyəli tədbir keçirildi. Tədbirdə ayrı-ayrı dövlət təşkilatlarının və təhsil müəssisələrinin, o cümlədən Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyası, Azərbaycan Dövlət İqtisad Universiteti, Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU), Qərb Universiteti, müxtəlif kollеclərin, habelə orta ümumtəhsil məktəblərinin təmsilçiləri iştirak edirdilər.

Tədbiri Səbail RİH-in başçısı Asif Əsgərov açaraq bildirdi ki, ölkə Prezidenti cənab İlham Əliyevin müvafiq sərəncamı ilə "Azərbaycan gəncliyi 2011-2015-ci illərdə" Dövlət Proqramı qəbul edilib. Bu Proqrama uyğun olaraq gənclər üçün xüsusi silsilə tədbirlər həyata keçirilir. Məhz həmin tədbirlər çərçivəsində gənclərimiz xarici tələbələrlə müxtəlif görüşlər keçirərək onlara xalqımızın gözəl adət-ənənələri, zəngin mədəni irsi, yüksək milli-mənəvi dəyərləri, habelə tarixi keçmişimiz, eləcə də bugünkü hərtərəfli inkişafımız barədə ətraflı və dolğun məlumat verirlər. Bununla yanaşı, Azərbaycan Respublikasının Prezidenti yanında Gənclər Fondu yaradılıb.

Azərbaycan Prezidenti cənab İlham Əliyev gənclərə böyük qayğı və diqqət göstərir. Belə tədbirlərin keçirilməsi də gənclərə göstərilən qayğı və diqqətin bir təzahürüdür. Səbail RİH-in başçısı Asif Əsgərov öz çıxışının sonunda gəncləri dövlət başçısı İlham Əliyevin ətrafında sıx birləşməyə çağırdı.

Sonra rəsmi qonaqlar çıxış edərək gəncləri təbrik etdilər, onlara təhsildə, idmanda və bütövlükdə ictimai-mədəni həyatımızın bütün sahələrində uğurlar arzuladılar. Gəncləri təbrik etmək üçün tədbirə Tünzalə Ağayeva, Ayaz Qasımov, Azəri qızı Günel və digər tanınmış müğənnilər də dəvət olunmuşdular.

Qeyd edək ki, tədbirdə ADPU-nunTərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev, Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri Vurğun Məmmədov, Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov,Tələbə Gənclər Təşkilatının (TGT) idarə heyəti və universitetimizin fəal tələbələri iştirak edirdilər. Tədbirdə "Gənclər günü" münasibətilə təltif edilənlər arasında universitet TGT-nin sədri Mahmud Möhbalıyev də var idi. M.Möhbalıyev Səbail rayon gəncləri arasında "İlin ən yaxşı təşkilatçısı" mükafatına layiq görüldü.

Gənclər də öz növbələrində bu tədbiri təşkil edən Səbail RİH-in rəhbərliyinə dərin təşəkkürlərini bildirdilər. Biz də M.Möhbalıyevi bu mükafata layiq görülməsi münasibətilə təbrik edir, ona yeni uğurlar arzulayırıq.

Gülnar SÜLEYMANOVA

# Pedaqoji təcrübənin yekunlarına həsr olunmuş konfrans



Fevral ayının 15-də Filologiya fakültəsinin qiyabi şöbəsinin IV-V kurslarında təhsil alan tələbələrin pedaqoji təcrübəsinin yekunlarına həsr olunmuş konfrans keçirilib.

Konfransda Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov çıxış edərək pedaqoji təcrübənin tələbələrin həyatındakı mühüm rolundan danışıb, pedaqoji təcrübənin gələcəyin müəllimləri üçün əslində bir sınaq olduğunu söyləyib və əvvəlki illərlə müqayisədə bu tədris ilində qiyabi şöbədə təhsil alan tələbələr arasında pedaqoji təcrübəyə marağın çox gücləndiyini xüsusi qeyd edib.

Konfransda tələbələrdən Sənəm Qurbanzadə, Nərgiz Abdullayeva, Vüsalə Ağayeva, Sevinc Abbasova və başqaları çıxış edərək pedaqoji təcrübədə olduqları orta təhsil müəssisələrində onlar üçün yaradılmış şəraitdən razılıq ediblər.

Sonda xüsusi qabiliyyətlərinə görə fərqlənən tələbələr müvafiq diploma mükafatlandırılıblar. Onu da qeyd edək ki, "Şair sözünə, musiqi çələnginə bəzənmiş görüş" məqaləsində haqqında bəhs edilən tədbirin keçirilməsində xüsusi fəallıq göstərmiş tələbələrdən Reyhan Manafova, Sevda Vəliyeva, Şamama Şahverdiyeva, Suğra Babayeva və Ülkər Əliyeva da diploma mükafatlandırılanlar arasında olub.

Gülnar Bəxtiyarqızı

# Kitabxanamız zənginləşir

1. Həsənağa Kovlarlı. "Dünyanamə". Bakı, "Qanun" nəşriyyatı, 2012, 704 səh.

Oxucularımıza təqdim etdiyimiz "Dünyanamə" əsəri, "Mərdliknamə" əsərinin üçüncü, tamamlayıcı kitabıdır. Əsərin birinci kitabı "Ölkənamə"- "Ölkə gözəlləri", ikinci kitabı "Şəhidnamə" - "Qaratəpə şəhidləri" adı ilə çap olunub. "Ölkənamə"də olan iyirmi iki surətin hamısı "Dünyanamə"də mərdlik zirvəsində fəaliyyətdədirlər.

"Mərdliknamə" əsəri qəhrəmanlıq epopeyasıdır.Müəllif ömrünün iyirmi ilini "Mərdliknamə"yə sərf etmişdir.

2. Səyyarə Qasımova. "Hüseyn Bozalqanlının poetik irsi". Bakı, "Elm və təhsil", 2012, 176 səh.

3. Komenski Y.A. "Böyük didaktika". Bakı, "Elm və təhsil", 2012, 388 səh.

Bu kitab nəşrə hazırlanarkən Y.A.Komenskinin 1961-ci ildə nəşr olunmuş "Seçilmiş pedaqoji əsərləri"ndən istifadə olunmuşdur. Kitabın giriş, I-XVII fəsilləri professor Aben Kərimov , XVIII-XXXIII fəsilləri professor Mərdan Muradxanov tərəfindən tərcümə edilmişdir.

4. Hüseynov V.A. "Kvant elektrodinamikası". Ali məktəblər üçün dərslik. Bakı, "Şərq-Qərb" nəşriyyatı, 2012, 235 səh.

Kitabda kvant elektrodinamikasının fundamental məsələlərinin, o cümlədən Hamilton formalizmində bozon və fermion sahələrinin ikinci kvantlanmasının, eləcə də yenidən normalanma ilə bağlı məsələlərin şərhinə geniş yer verilmişdir.

Azərbaycan dilində yazılmış bu ilk dərslik ali təhsil müəssisələrinin magistr təhsil pilləsi üçün nəzərdə tutulmuşdur.

5. Pərvanə Zəngəzurlu. "İslam inciləri". Baki, "Kooperasiya" nəşriyyatı, 2012, 252 səh.

Almanaxda dərc olunan şeirlərin hər biri uca Allah-Taalaya olan sonsuz sevgi ilə qələmə alınmışdır.

6. Baba Məhərrəmli. "Türk dillərində isim köklərində leksik-semantik inkişaf". Bakı, "Elm və təhsil", 2012, 400 səh.

Kitabda Azərbaycan dilçiliyində ilk dəfə olaraq yüzə yaxın dilin materialından, analoji faktlarından istifadə olunmuş, isim köklərinin ətraflı müqayisəli-etimoloji analizi verilmişdir.

7. "S dnem rojdenia, doroqoy Prezident!" Baku, 2011.

8. Muxtar Abduyev. "Delüvial formalı şorlaşmış torpaqlar və onların meliorasiya məsələləri". Bakı, "Elm" nəşriyyatı, 2012.

9. Muxtar Abduyev. "Azərbaycanın gilli şoranlıqlarının sürətli meliorasiyası". Bakı, "Elm" nəşriyyatı, 2012.

10. Muxtar Abduyev. "Azərbaycanda şorakət torpaqlar və onların yaxşılaşdırılması". Bakı, Azərbaycan dövlət nəşriyyatı, 2012.

11. Muxtar Abduyev. "Azərbaycanın düzənlik hissəsinin delüvial formada şorlaşmış torpaqları". Bakı, "Elm" nəşriyyatı, 2012.

12. Ramiz Asəf oğlu Qasımlı. "Cəlil Məmmədquluzadə yaradıcılığında "kiçik" adam obrazlarının ictimai-bədii funksiyası". Monoqrafiya. Bakı, "Elm və təhsil", 2012, 216 səh.

Monoqrafiya milli mücadilə ədəbiyyatımızın bayraqdarı, böyük Azərbaycan yazıçısı, publisist, naşir, ictimai xadim Cəlil Məmmədquluzadənin həyatından bəhs edir.

13. Zülfiyyə Hüseyn qızı İsmayıl. "Azərbaycan dilində qeyri-təyini birləşmələr". Monoqrafiya. Bakı, "Elm və təhsil", 2012, 192 səh.

Monoqrafiya ən böyük milli-mənəvi dəyərimiz olan ana dilinə həsr olunub.

Monoqrafiya ali məktəblərdə dil tarixi və sintaksisin tədrisi zamanı istifadə edilə bilər.

14. Səmayə Mustafayeva, Zərifə Cavadova, Raminə Hüseynli. "Almaniya və İtaliyanın ən yeni tarixi (1918-2010-cu illər)". Dərs vəsaiti. Bakı, ADPU-nun nəşriyyatı, 2012, 289 səh.

Ali məktəblər üçün dərs vəsaitidir.

15. "Müasir təhsilin psixoloji problemləri". Bakı, "Mütərcim", 2012, 304 səh.

Kitabda müasir təhsilin aktual psixoloji problemlərinin nəzəri və praktik məsələləri öz əksini tapmışdır.

Kitab praktik psixoloqlar, tələbələr üçün nəzərdə tutulmuşdur.

16. Sənan İbrahimov. "Azərbaycan ədəbiyyatşünaslığının tarixi, metodologiyası və problemləri". Bakı Dövlət Universiteti, 2012, 183 səh.

Professor Sənan İbrahimov kitabı ali məktəblərin magistratura pilləsində tədris edilən "Ədəbiyyatşünaslığın tarixi, metodologiyası və problemləri" fənninin proqramları əsasında yazılmışdır.

17. Ceyhun Məmmədov. Şəmsəddin əs-Səxavi və onun "Richanul-kəffəti fi bəyəni nubzətin min əxbəri əhlis-suffə" əsəri. Bakı, "Nafta-Press", 2012.

Əsərdə İslamda ilk təlim və təhsil mərkəzi sayılan süffənin meydana gəlməsindən, süffə əhlinin islam elmlərinin inkişafındakı xidmətlərindən bəhs edir.

Kitab dinşünaslar, elmi işçilər, ali məktəb müəllimləri, tələbələri üçün nəzərdə tutulur.

18. Balayeva V., Hüseynov S., Qaracayeva E. "Azərbaycan dili" (Az.DBTİA-nın bakalavr təhsil pilləsində I kurs rus bölməsi tələbələri üçün dərslik). Bakı, "Mütərcim", 2012, 216 səh.

Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyasının bakalavr təhsil pilləsində rus bölməsində oxuyan tələbələri üçün nəzərdə tutulmuş bu dərslik "Azərbaycan dili" fənninin proqramı əsasında yazılmışdır.

19. Elmir Vəlizadə, Ziyafət Əmirov. "Microsoft Office - 2007 paketi". Bakı, "Şərq-Qərb", 2012, 756 səh.

Kitab kompyuterdən səmərəli istifadə etmək, öz peşə fəaliyyətində vacib olan sənədlər, təqdimatlar, cədvəllər və məlumat bazaları yaradaraq onlardan istifadə etmək istəyən hər bir şəxs üçün nəzərdə tutulmuşdur.

20. Salatın Əhmədova, Teymur Əhmədov. "XIX-XX əsr Azərbaycan ədəbiyyatı". 2 cilddə. II cild. Bakı, "Nurlar" Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2012, 712 səh.

Kitaba XIX-XX əsrlərdə Şimali və Cənubi Azərbaycan yazıçılarının şəxsiyyətləri haqqında məlumat, əsərlərindən nümunələr daxil edilmişdir.

21. Qasanov A.M. "Qeopolitika". Uçebnik. Baku. İzdatelcstvo "Zərdabi LTD" MMC, 2012, 688 c.

22. Telman Həbibov. "Ümumi geologiya". Universitetlərin coğrafiya fakültəsi tələbələri üçün dərslik. Bakı, ADPU-nun nəşriyyatı, 2012, 392 səh.

23. Arif Umud oğlu Məmmədov. "Ümumi psixologiya". Bakı, "Elm və təhsil", 2012, 792 səh.

Dərs vəsaitində müasir psixologiya elminin mövzusu, prinsipləri-nin təhlili öz əksini tapmışdır.

24. Rəfail Ayvaz oğlu Əhmədli. "Mirzə Kazımbəyin ictimai fikirləri". Bakı, "Elm" nəşriyyatı, 2012, 200 səh.

Monoqrafiyada M.Kazımbəyin elmi görüşləri, onun həyatı və elmi-pedaqoji fəaliyyəti şərh edilir.

25. Əzizxan Tanrıverdi. "Türk mənşəli Azərbaycan şəxs adlarının tarixi-linqvistik tədqiqi". Bakı, "Elm və təhsil", 2012, 214 səh.

Monoqrafiyada türk mənşəli Azərbaycan antroponimləri diaxronik və sinxronik müstəvidə təhlil edilmişdir.

26. Rəhilə Məhərrəmova. "XV-XVI əsrlər Azərbaycan ədəbi dili: Leksika. Söz yaradıcılığı". Bakı, "Elm və təhsil", 2012, 224 səh.

27. Məhəmməd Həsənov. "Seçilmiş əsərləri". II cild. Bakı, ADPU-nun nəşriyyatı, 2012, 430 səh.

Məhəmməd Həsənovun "Seçilmiş əsərləri"nin II cildində müəllifin Azərbaycan dilinin tədrisi metodikasının ümumi məsələlərinə, fonetika və orfoqrafiyanın, eləcə də morfologiya tədrisinin bəzi məsələlərinə dair əsərləri toplanmışdır.

28. Aydın Mirzəzadə. "Qarabağ düyünü". Bakı, "Azərbaycan" nəşriyyatı, 2012, 608 səh.

29. Bəxtiyar Əsgərov. "M.S.Ordubadinin dramaturgiyası". Bakı, "E.U." NPŞ, 2012, 184 səh.

Monoqrafiya Azərbaycan ədəbiyyatının böyük simalarından olan M.S.Ordubadinin dramaturgiya yaradıcılığından bəhs edir.

30. S.Şükürlü, "Virtual Oftalmoloq" ekspert sistemi. Bakı, "İnformasiya texnologiyaları nəşriyyatı", 2012, 188 səh.

Kitabda tibbin oftalmologiya sahəsinə aid mövcud ekspert sistemləri və onların tətbiqi sahələri araşdırılmış, qısa xülasəsi verilmişdir.

31. Zeynalov Cavanşir İbrahim oglu. "İnformatika". ADPU-nun nəşriyyatı, Bakı, 2012, 588 səh.

Kitabda informatikanın əsas anlayışları, EHM-lərin yaranma tarixi və və inkişaf yollarına uyğun testlər verilmişdir.

32. Bəhlul Cəfərov, Alı Əliyev, Nərminə Süleymanova. "Avrasiya materikinin fiziki coğrafiyası". Bakı, ADPU nəşriyyatı, 2012, 135 səh.

Universitetlərin coğrafiya fakultəsi üçün dərslikdir.

33. Qarayev M.A., Hüseynzadə Ş.M. "İnsan ekologiyası". Mühazirələr konspekti. Bakı, "Təhsil" NRM, 2012, 264 səh.

İnsan ekologiyası sahəsində toplanmış elmi-tədqiqat və tədris materialları bircildlik tədris vəsaiti kimi təqdim edilir.

34. Kamil Kamal oğlu Beşirov. "Azərbaycan dilində sinonim qoşa sözlər lüğəti (dərs vəsaiti)". Bakı, "Elm və təhsil", 2012, 180 səh.

Əsərdə Azərbaycan dilində işlənən qoşa sözlər haqqında yığcam nəzəri məlumatlar verilmişdir.

35. İsmayilova Təranə İmran qızı. "Azərbaycan dilinin tədrisi metodikasına dair müntəxəbat". Bakı, ADPU-nun nəşriyyatı, 2012, 307 səh.

36. Mahmud Allahmanlı. "Folklorşünaslıq məsələləri (məqalələr)". Bakı, "Elm və təhsil", 2012, 284 səh.

Kitabda müəllifin son illərdə şifahi ədəbiyyatın müxtəlif problemləri ilə bağlı yazılmış məqalələri toplanmışdır.

37. Jalə Qədimova. "Musiqi pedaqogikası: tarixilik və müasirlik". Bakı, "MBM", 2012, 224 səh.

"Musiqi pedaqogikası: tarixilik və müasirlik" adlı dərs vəsaitində musiqi pedaqogikasının tarixi aspektləri işlənilmişdir.

38. Zenfira İsmayıl qızı Vəliyeva. "Məktəbəqədər yaşlı uşaqların əxlaq tərbiyəsi". Bakı, ADPU-nun nəşriyyatı, 2012, 136 səh.

39. Məhəmməd Baharlı. "Seçilmiş əsərləri, 4 cilddə".

I cild: "Publisistika (axtarışlardan sensasiyalaradək)". Bakı, "Nurlan" nəşriyyatı, 2012, 209 səh.

Əsərin bu cildində müəllifin axtarış və tapıntıları, görüş və xatirələri, tarix, ədəbiyyat, cəmiyyət, təhsil və digər taleyüklü milli məsələlər barədə mühazirələri yer almışdır.

II cild: "Poeziya ("Qoca türkün şərqiləri")", Bakı, "Elm və təhsil", 2012, 240 səh.

Müəllifin dördcildliyinin bu nəşrində ictimai mövzulu və lirik şeirlər yer almışdır.

III cild: "Proza (povest, hekayə və yumorlar)". 264 səh.

IV cild: "Pedaqogika (Məktəb və pedaqoji işə rəhbərlik)". Bakı, "Elm və təhsil", 2012, 120 səh.

Bu elmi-metodik kitabda gənc nəslin təlim-tərbiyə işlərinə rəhbərlik məsələlərindən bəhs olunur.

40. Salatın Əhmədli. "Səfərnamə" (II kitab). Bakı, 2012, 288 səh.

Kitabda müəllifin bir sıra ölkələrə etdiyi səfərlərdən, həmin ölkələrin xalqlarının adət-ənənələrindən, tarixi yerlərindən, abidələrindən söhbət açılır.

**Nüşabə Əmirəliyeva,**
**ADPU-nun Elmi kitabxanasının məlumat-biblioqrafiya şöbəsinin müdiri**

# TƏLƏBƏLƏRİMİZ PEDAQOJİ TƏCRÜBƏDƏ

Biz bu günü çoxdan gözləyirdik. Nəhayət, fevral ayının 18-i gəldi və biz - Filologiya fakültəsinin əyani şöbəsində ingilis dili müəllimliyi ixtisası üzrə təhsil alan 308-ci qrupun tələbələri Bakı şəhərinin Nərimanov rayonundakı 45 saylı orta məktəbə pedaqoji təcrübəyə yollandıq. Təcrübə metodistimiz Xarici dillər kafedrasının baş müəllimi Taisa Quliyeva idi. 45saylı məktəbə digər universitetlərin tələbələrindən də pedaqoji təcrübəyə gələnlər var idi.

Məktəbin direktoru, müəllimlər bizi çox mehriban, səmimi qarşıladılar, bizim üçün istənilən şəraiti yaratdılar. Biz də bu qayğıya cavab olaraq öz növbəmizdə gündəlik dərslərdə iştirak etməklə yanaşı, məktəbin ictimai-mədəni həyatında fəal iştirak edir, məktəbdə keçirilən tədbirlərə əsl gənclik həvəsi ilə qatılırdıq. Bütün bu işlərdə metodistimiz Taisa müəllimə, həmçinin məktəbin direktoru və müəllimləri öz qayğı, diqqət və köməklərini bizdən əsirgəmirdilər. Xüsusilə 8 Mart - Beynəlxalq Qadınlar gününə və Xocalı soyqırımının iyirmi birinci ildönümünə həsr etdiyimiz tədbirlər yaddaqalan oldu.Xocalı soyqırımına həsr etdiyimiz tədbir məktəbin akt zalında keçirildi. Tədbirdə edilən çıxışlar, söylənilən şeir nümunələri ingilis dilində səsləndirildi. Taisa müəlliminin Xocalı soyqırımı haqqında ingilis dilində etdiyi qısa, lakin dərin məzmunlu çıxış hamı tərəfindən rəğbətlə qarşılandı.

Tələbələrdən Yemən, Ayşən, Könül, Tamam və Türkanın pedaqoji təcrübə müddətindəki fəallığı müsbət qiymətləndirildi. Tədbir ulu öndər Heydər Əliyevin dillər əzbəri olan və aforizmə çevrilmiş "Hər bir xalqın milli mənsubiyyəti onun qürur mənbəyidir. Mən həmişə fəxr etmişəm, bu gün də fəxr edirəm ki, mən Azərbaycanlıyam!" kəlamı ilə yekunlaşdı.

**Könül Alıyeva,**
**Filologiya fakültəsinin 308-ci qrup tələbəsi**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi-Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Mais Əmrahlıya anası
**Sədayə Əmrahlının**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının dosenti Allahverdi Hacıyevə həyat yoldaşı
**Xumar xanımın**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi-Cəbr və həndəsə kafedrasının dosenti
**Üfüq İsmayılovanın**
vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.


| Redaktor: A. Z. İSGƏNDƏROV | ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi-34, ADPU, Tel.: 498-18-41 | Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır | Mətbuat və informasiya şöbəsinin web-portalı www.press.adpu.az Şəhadətnamə № 191 | Sifariş: 1220 Sayı: 1500 Çapa imzalanıb: 28.02.2013-cü il | ADPU-nun mətbuat və informasiya şöbəsinin kompyuter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir. |
|---|---|---|---|---|---|